# Mündəricat

Bismillahir rəhmanir rəhim

الحمد لله ربّ العالمین و الصلاه و السلام علی رسول الله و آله الاطهار

و اللعنه علی اعداء الله من الآن الی قیام یوم الدین آمین یا ربّ العالمین

Sözümüzü Mütəal Allahın razı olduğu bir kəlamla başlayırıq. Bu kəlam, mö'minlərin əmiri həzrət Əlinin (ə) fəzilətlərindən zikr etməkdir. Yaradılış aləminin sirri Xatəmul-Ənbiya, Mühəmməd Əl-Müstəfa (s); bir kəs ki, öz nəfsi istəklərindən heç bir söz demir və hər nə desə ilahi vəhy əsasındadır, necə ki, Mütəal Allah Qür'ani-Kərimdə bunu təsdiqləyərək, biz dərki zəifləri anlatmaq və ayıltmaq üçün təkid edərək, hətta and içib, buyurur: And olsun batmaqda olan ulduza ki, sizin dostunuz (və yoldaşınız Mühəmməd) nə yolundan çıxıb və nə də (əqidəsindən) azıb. Və nəfsi istəkləri ilə danışmır. Dedikləri yalnız ona nazil olan vəhydir(١) buyurur:

قال رسل الله ( ص): ان الله تعا لی جعل لآخی علی ابن ابی طالب (ع) فضائل لا یحصا عددها غیره فمن ذکره فضیله من فضاءله مقرا بها غفرالله له ما تقدم من ذنبه و ما تاخر و لو و افا القیامه بذنوب الثقلین.

Allah Təala, qardaşım Əliyyibni əbi Talib (ə) üçün fəzilətlər qərar verib ki, Onun Özündən başqa heç kəs bunları sayıb qurtara bilməz. Hər kəs onun fəzilətlərindən birini zikr etsə və ona imanı olsa, Allah onun keçmiş və



---

١- [١] Nəcm surəsi: ayə١-۴.

gələcək günahlarını, Qiyamət günü də olsa və günahları ins və cinlərin qədərində də .olsa belə bağışlayar

و من كتب فضيله من فضائله على (ع) لم تزل الملائكه تستغفر له ما بقى لتلك الكتا به رسم.

O həzrətin fəzilətlərindən birini yazan şəxs üçün, o yazı qaldıqca mələklər istiğfar .edirlər

و من سمع الى فضيله من فضئله غفر الله له الذنوب التى اكتسبها با الا ستماع .

Allah, o həzrətin fəzilətlərindən birini eşidən şəxsin, qulaq vasitəsi ilə etdiyi günahlarını .bağışlayar

و من نظر الى كتا ب فيه فضا ئله غفر الله له الذنوب التى اكتسبها با لنظر.

Allah, o həzrətin fəziləti yazılan kitaba baxan şəxsin, göz vasitəsi ilə düçar olduğu (günahlarını bağışlayar.(١

:Mütəal Allah buyurur

لو اجتنمع الناس كلّهم على ولايت على (ع) لما حلقت النا ر

Bütün insanlar Əlinin (ə) vilayətini qəbul etsəydilər, Mən cəhənnəm odunu (yaratmazdım.(٢

Əta deyir: Ayişədən Əli (ə) barədə soruşdum, dedi: O, bəşərin ən üstün şəxsidir. Onda (kafirdən başqa heç kəs şəkk etməz.(٣

Bu kitabda Əlinin (ə) fəzilətlərindən zikr etməkdə məqsəd Allahın razılığını cəlb etməkdir. Əgər biz o həzrətin fəzilətlərindən yazsaq qatar-qatar kitab olar və yenə də qurtarmaz. Bu kitabda bizim məqsədimiz, imam Hüseynin (ə) nazdanəsi həzrət Rüqəyyənin (ə) həyatı



---

.Səvabul-əəmal,səh.۲۹۶ [۲] -۱

olduğundan, bu üç hədislə kifayətlənirik. Bir də ki, Əli (ə) və onun on bir övladı, bir şəxslərdirlər ki, dost da, düşmən də onların fəzilətlərindən danışır, bir nurdurlar ki, iki əsrə yaxın hədis nəql etməyi qadağan etməklə, səksən il minbərlərdə onlara qarşı nalayiq sözlər dedizdirib, əks təbliğat aparmaqla, özlərinə, ailələrinə, dostlarına qarşı olmazın zülmlər etməklə, qaranlıq həbsxanalar küncündə saxlamaqla, şəhid etməklə söndürmək olmaz. Bəlkə bu nurların qarşısını almaq istəyən zülmətlərdən, hiyləgər münafiqlərdən danışıb, onları ifşa etmək lazımdır. Bir münafiq və hiyləgərlər ki, Peyğəmbərin (s), o nurları, yəni əhli beyti (ə) ümmətə tanıtmağına, onların fəziləti və hamıdan üstün olmağını çatdırmasına, bir çox Qür’an ayə və surələrinin onların şə’nində və haqq canişinlər olmaqları barəsində nazil olmasını bəyan etməsinə, hamının gözü qarşısında aylarla onların evinə gedib, onlara əhli beytim deyərək, namaz vaxtının olduğunu xəbər verməsinə, onları özünün və Allahın sevdiyini, onlarla dostluğun Peyğəmbər (s) və Allahla dostluq, düşmənçiliyin isə Allah və Peyğəmbərlə (s) düşmənçilik olduğunu elan etməsinə, onlara məhəbbəti vacib etməsinə, özünün ümməti arasında ən ağır əmanətləri olduğunu bəyan etməsinə, Qədri-Xumda yüz iyirmi min müsəlmanın gözü qarşısında Əlini (ə) özündən sonra canişin və müsəlmanların Allah tərəfindən təyin edilmiş rəhbəri olduğunu elan etməsinə, orada olanların hamılıqla Əliyə (ə) bi’ət etməsinə baxmayaraq, bu hiyləgər münafiqlər Peyğəmbər (s) dünyadan gedən kimi xalqı aldadıb, xilafəti ələ keçirdilər, haqqa və haqq yolunun hidayətçilərinə zülm etdilər: Peyğəmbərin (s) gözünün nuru, həzrət Fatimeyi Zəhranın (ə) evinə hücum çəkib, qapısına od vurdular, mismar mübarək sinəsini yaraladı, qabırğalarını və qolunu

sındırdılar, qəmçi ilə döydülər, haqqını əlindən alıb, küçədə mübarək rüxsarına sili vurdular... Haqq canişinləri olan “şəcəreyi təyyibəni” öz haqlarından uzaqlaşdırıb, xilafəti İslamın və Peyğəmbərin (s) düşmənləri olan “şəcəreyi xəbisəyə” təhvil verdilər.(۱) Biz, imam Hüseynin (ə) üç yaşlı nazlı qızı həzrət Rüqəyyənin (ə) çəkdiyi müsibətləri bilmək üçün gərək, xəbis şəcərəni, yəni, İslam düşmənləri olan Bəni Üməyyəni tanıyaq, onların necə mənfur və zalım olduqlarını, İslam və əhli beytlə (ə) .düşmənçiliklərinin həddini biləkk



---

۱- [۵]Şəcəreyi təyyibə və şəcəreyi xəbisə Qür’anın İbrahim surəsinin ۲۴-۲۷-ci ayələrində gəlib. Şəcəreyi təyyibə yəni, pak ağacdan məqsəd, həzrət Peyğəmbər (s), Fatimeyi Zəhra (ə) və pak imamlardırlar (ə). Şəcəreyi xəbisə yəni, napak və xəbis ağacdan məqsəd, onların düşmənləri, yəni, Bəni Üməyyədir. Təfsiri Əliyyibni İbrihim .və təfsiri Əyyaşi: İbrahim surəsinin ۲۴-۲۷-ci ayələrinin təfsiri

### Lənətlənmiş şəcərə və meymunlar

وما جعلنا الروء يا التى الا فتنه للناس والشجره الملعونه فى القرآن و نخوفهم فما يزيدهم الا طغيا نا كبيرا

Və sənə göstərdiyimiz o yuxunu və Qür’anda lə’nətlənmiş o ağacı(۱) insanlar üçün yalnız bir sınaq etdik. Biz onları qorxuzuruq, amma bu onlarda böyük itaətsizlikdən (başqa bir şey artırmır(۲

Təfsirçilər yekdilliklə bu ayənin təfsirində yazıblar: Peyğəmbəri Əkrəm (s) yuxuda, meymunların onun minbərinə çıxdıqlarını gördü və bu yuxudan çox pərişan oldu. Cəbrail nazil oldu və yuxunu belə təbir etdi: Bəni-Üməyyə, Bəni Haşimə qələbə edər və Peyğəmbərin (s) minbərinə çıxarlar. Onlar lə’nətlənmiş şəcərədirlər. Rəvayət olunub (ki, bundan sonra daha heç kəs Peyğəmbərin (s) gülməsini görmədi.(۳

### ?Üməyyə kimdir

Üməyyə, bədnam, arvadbaz bir kişi idi və zinada məşhur idi. O həmin kəsdir ki, on il vətəndən uzaqlaşdırıldı, Məkkədən Şama getdi, orada on il qaldı, ərli bir yəhudi qadınla (zina etdi. O qadın ərinin evində (o da yəhudi idi



---

.”Lənətlənmiş ağac, Bəni Üməyyədir. “Təfsiri Qumi” və “Təfsiri Əyyaşi[۶] -۱
.İsra surəsi: ayə ۶۰ [۷] -۲
.Təfsiri Məcməul bəyan: ۳-cü cild, “Təfsiri Nurus-səqəleyn” ۳-cü cild“ [۸] -۳

bir oğlan dünyaya gətirdi. Üməyyə onu öz övladı elan etdi və Zəkəvan adlandırıb, Əbu (Əmr künyəsi verdi. Sonra özü sağkən öz arvadını ona verdi.(١)

### İslam və islam Peyğəmbərinin (s) düşməni, Əbu Süfyan

Peyğəmbərin (s) be’sətinin əvvəlindən, o həzrətin vəfatına kimi Əbu Süfyan İslam və İslam Peyğəmbəri (s) ilə aşkar düşmənçilik etdi, Qüreyş müşriklərinə bu işdə rəhbər olub, onlara himayədarlıq etdi. O, küfrün bayrağını əlində tutaraq İslama qarşı qılınc .çəkdi

Məşhur əhli-sünnə alimi, Zəməxşəri deyir: Əbu Süfyan qısa boylu, bəd qiyafəli idi və Hind (Əbu Süfyanın arvadı) ərinin muzduru, təravətli bir cavan olan Səbaha, alıcı gözü ilə baxdı, nəhayət özünü saxlaya bilmədi, onu özünə tərəf çağırdı. Onların arasında gizli əlaqə bərqərar oldu, bu əlaqənin nəticəsində, tarixçilərin əqidəsinə görə, Müaviyyədən əlavə Ütbə də Səbahdandır. Yenə deyiblər: Hind, bu uşağı Əbu Süfyanın evində dünyaya gətirməyinə razı deyildi, ona görə də biyabanlara üz qoydu və Ütbəni .orada, tək dünyaya gətirdi

Hind ciyərçeynəyən adı ilə tarixdə məşhurdur. O Peyğəmbərin (s) əmisi Həmzənin ciyərini Ühüd döyüşündə dişinə çəkdi və cəyəri tikə-tikə etdi, ipə düzüb boynundan .asdı

!Bu ailənin İslamla düşmənçiliyi gör nə həddədir

Əbu Süfyan deyirdi: İlahi, cahiliyyət dövrünü bir daha bizə qaytar...(٢) Yenə deyirdi: And olsun Allaha, əgər diri



---

.Bax: Pərtoyi əz əzəmət İmam Hüseyn (ə), Ayətullah Safi Gülpayəqani[٩] -١

.Bax: Hezar mahi siyah,səh. ۶٣ [١٠] -٢

qalsam, hökuməti Haşimilərin əlindən alacağam.(۱) Osman xilafətə çatan zaman Əbu Süfyan onun yanına gəlib dedi: Xilafəti çarx kimi Bəni Üməyyənin əlində fırlat. Çünki, xilafət və risalət, səltənətdən başqa bir şey deyil, mən Cənnət və Cəhənnəm (bilmirəm.(۲

Oğlu Müaviyyə də İmam Həsəni (ə) sülhə məcbur edib xilafəti ələ keçirdikdən sonra aşkarcasına dedi: Mən din yolunda sizinlə döyüşməmişəm. Bəlkə, sizə hakim olmaq (üçün sizinlə döyüşdüm.(۳

## Müaviyyə hiyləgər

Hər vaxt Müaviyyəni mənim اذا راءيتم معاويه على منبرى فقتلوه :Peyğəmbəri Əkrəm (s) buyurub (minbərimin üstündə görsəniz, onu öldürün.(۴

Müaviyyənin cinayəti saysız-hesabsızdır. O, Əliyə (ə) tabe olmadı, İmam Həsəni (ə) sülh bağlamağa məcbur etdi və sülhnamənin maddələrinə əməl etmədi, şiələri çoxlu .əziyyətlər etdi. Xülasə, Müaviyyə istədiyini edirdi

## Müaviyyə mənfur

Bir gün Peyğəmbər (s), ibn Əbbası, Müaviyyəni çağırmağa göndərdi. İbn Əbbas, neçə dəfə gedib



---

.İmam Əli (ə), səh ۲۱۲ [۱۱]-۱

.Bax: Fəlsəfeyi inqilabi Hüseyn (ə), səh ۲۸ [۱۲]-۲

.Bax: Ayişə dər dövrani Müaviyyə, Seyyid Mürtəza Əsgəri, səh.۱۲۵ [۱۳]-۳

.Əl-ğədir ۱۰-cu cild, səh.۱۴۲. Mizanul-e’etidal Zəhəbi ۲-ci cild, səh.۷ və ۱۲۹ [۱۴]-۴

Peyğəmbərin (s) sifarişini ona çatdırdı, amma hər dəfə Müaviyyə, yemək yeməyə məşğul olduğunu deyirdi. İbn Əbbas, bunu Peyğəmbərə (s) xəbər verdi. Həzrət buyurdu: Allah heç vaxt onun qarnını doyuzdurmasın. Peyğəmbərin (s) nifrini nəticəsində Müaviyyə heç vaxt yeməkdən doymurdu. O deyirdi: Mənim yeməkdən əl .çəkməyim doymaq üzündən deyil, bəlkə yeməkdən yorulmağıma görədir

(Müaviyyə şərab içirdi və İslam adı ilə hökumət edirdi.(١)

## Müaviyyə xilafəti səltənətə çevirdi

Əmir-əl-möminin Əlinin (ə) şəhadətindən sonra, xalq ikinci imam, Həsən ibn Əli (ə) ilə bi’ət etdilər. Səltənət havasında olan Müaviyyə sakit otura bilmədi və imama qarşı .qoşun çəkib, döyüşə qalxdı

Müaviyyə müxtəlif hiylələr və pul verməklə imamın adamlarını və sərkərdələrini ələ alıb, özünə tərəf çəkdi. Nəhayət, sülh ünvanı ilə imam Həsəni (ə) xilafəti ona tapşırmağa məcbur etdi. İmam (ə), xilafəti bu şərtlə Müaviyyəyə verdi ki, Müaviyyə öləndən sonra yenə xilafəti imam Həsənə (ə), (və imam Hüseynə) qaytarsın, şiələri incitməsin, Müaviyyə, Allah Kitabı və Peyğəmbərin (s) sünnəsi əsasında xilafəti idarə etsin...(٢) Qırxıncı hicri ilində Müaviyyə İslam xilafətini ələ keçirdi, fasiləsiz olaraq İraqa gəlib, moizə etdi, camaata xədərdarlıq edib, dedi: Mən sizinlə namaz, oruca görə döyüşmürdüm, bəlkə sizə hökumət etmək istəyirdim və öz məqsədimə



---

.Əl-ğədir, ١٠-cu c səh. ٨٣[١٥]-١
.Tarixi-Yəqubi, ٢-ci cild, səh.١٩١ [١۶]-٢

çatdım.(١) O yenə deyirdi: İmam Həsənlə (ə) bağladığım sülh peymanı mənim ayağım (altındadır(٢

Müaviyyə bununla işarə edirdi ki, dini öhdəliklərə əməl etməyəcək və bütün qüvvəsini öz hökumətini saxlamağa sərf edəcək. Əlbəttə, mə'lum idi ki, o dini işlər, İslamın irəliləyişi və xalqın rifahı barəsində fikirləşsəydi, heç vaxt xilafəti imam Həsənin (ə) əlindən almazdı. Çünki Müaviyyə də yaxşı bilirdi ki, xilafəti idarə etməyə ən layiqli şəxs, .(imam Həsəndir (ə

Müaviyyə xilafəti şahlığa çevirdi və hətta onun hüzuruna gələnlərin bəziləri ona padşah ünvanı ilə salam verirdilər.(٣) Özü də bəzi xüsusi məclislərdə öz hökumətindən (şahlıq təbir edirdi.(۴

O heç bir dini anlayışı olmayan, aşkara vaxtını şərab məclislərində keçirən, it və meymun oynadan, öz məhrəmləri ilə zina edən, heç bir ədəbi olmayan, hətta siyasətdən belə xəbəri olmayan oğlu Yezidi, özündən sonra xəlifə tə'yin etdi və bu işin qarşısında mane ola biləcək qüvvələri aradan götürdü, o cümlədən, imam Həsəni (ə) zəhərlətdirdi.(۵) O, elan etdi ki, hər kəs əhli beytin (ə) fəzilti barəsində hədis nəql etsə, onun canı, malı, namusu, nəsli amanda deyil, başqa tərəfdən isə özü kimi səhabələrin və başqa xəlifələrin barəsində hədislər qurmağı göstəriş verdi, hədis quranlara çoxlu hədiyyələr



---

١- [١٧] Təbəri, ۴-cü cild, səh ١٢۴. İbn Əsir, ٣-cü c, səh٢٠٣.

٢- [١٨] Həmin mənbə.

٣- [١٩] Yəqubi ٢-ci cild, səh.١٩٣.

۴- [٢٠] Yəqubi ٢-ci cild, səh.٢٠٢.

۵- [٢١] Muvərricul- zəhəb, ٣-cü cild, səh.۵. Əbul Fəda, ١-ci cild, səh. ١٨٣.

verdi. Həmçinin, İslam ölkələrinin minbərlərinin hamısında Əliyə (ə) nasəza deyilməsini göstəriş verdi. Müaviyyə, Əlinin (ə) şiələri olan Peyğəmbər (s) səhabələrini öldürdü.(١)

## Acı təbliğat

Bəni Üməyyə aparatı Şamda, Əlinin (ə) ziddinə elə təbliğ etmişdi ki, camaat haqla batili bir-birindən ayıra bilmirdilər, hətta Müaviyyədən başqa Peyğəmbər (s) üçün heç bir qohum tanımırdılar. İmam Səccad (ə), Yezidin sarayında özünü və əhli beyti (ə) xalqa tanıtdıqdan sonra, yetmiş nəfər qəbilə başçısı gəlib o həzrətdən üzr istədi və Müaviyyədən başqa Peyğəmbər (s) üçün qohum tanımadıqlarını dedilər. Şamda Əlinin (ə) əksinə o qədər təbliğ olunmuşdu ki, o həzrət mehrabda şəhadətə çatarkən, Şam əhli təəccüb edib dedilər: məgər Əli (ə) namaz qılırdı ki, məscidə gedib və onu mehrabda öldürüblər?!

## Müaviyyənin ardıcılları naqə və nər arasında fərq qoymurlar

Kufə əhlindən olan bir kişi, Süffeyindən qayıdarkən dəvəyə minib, Dəməşqə gəldi. Şam camaatından olan birisi dəvənin onunku olduğunu iddia edib dedi: Sənin mindiyin dəvə mənimdir və onu Süffeyn döyüşündə qarət etmişdilər, sənin əlinə düşüb. Onların mübahisəsi heç bir nəticə vermədi və nəhayət, Müaviyyənin yanına getdilər. Dəməşqli kişi, naqənin (dişi dəvə) onun malı olmasına əlli nəfər şahid gətirdi. Yəni, əlli nəfər, dişi dəvənin bu kişinin olmasına şəhadət verdilər. Müaviyyə də bu əlli nəfərin şahidliyi əsasında, naqənin Dəməşqli kişinin olmasına



---

١- [٢٢] Ənnəsayihul-Kafiyə, səh.٥٨,٦٤, ٧٧, ٧٨.

hökm etdi və İraqlı kişini dəvəni ona təhvil verməyə məcbur etdi. İraqlı kişi dedi: Bu dəvə naqə deyil, cəməldir (erkək dəvədir). Müaviyyə dedi: Hökmü vermişəm, qayıda bilmərəm! Camaat getdikdən sonra İraqlı kişini çağırıb dəvənin qiymətini ondan soruşdu. Sonra dəvənin qiymətindən də artıq ona pul verib dedi: Əliyə (ə) xəbər apar ki, onunla döyüşə yüz min elə adam gətirirəm ki, naqə ilə nər arasında fərq qoymurlar! .Yəni, əgər naqəyə nər, nərə naqə desəm, sorğu-sualsız qəbul edirlər

Məsudi bu dastanı nəql etdikdən sonra yazır: Camaatın Müaviyyədən itaəti və onun hökmünün nüfuzu bir yerə çatdı ki, Süffeyn döyüşünə gedərkən, cümə namazını çərşənbə gününə elan etdi və camaatla cümə namazı qıldı, heç kim: bu gün (çərşənbədir, nə üçün cümə namazı? demədi.(١)

### İki zidd göstəriş

Əlinin (ə) öz qoşunlarına göstərişi bu idi: Azacıq də olsa belə nahaq qan tökməyin. Müaviyyənin öz qoşunlarına göstərişi belə idi: Uşaqları və qadınları belə öldürməkdən .əl saxlamayın

Müaviyyə göstəriş verdi ki, İslam şəhərlərini axtarsınlar və Əlinin (ə) tərəfdarlarından olan hər bir kəsi öldürsünlər. Amma, Əli (ə) valilərinə buyururdu: Səninlə döyüşməyənlərlə döyüşmə və müsəlmanlarla əhd bağlayan xristian və yəhudilərə .zülm etmə



---

.Bax: Müvərricüz-zihab, Məsudi [٢٣] -١

## Müaviyyə düşmənçilikdən Peyğəmbəri Əkrəmin (s) adını eşitmək istəmirdi

Müğeyrənin oğlu deyir: Atam Müğeyrə, Müaviyyənin yanına get-gəl edirdi. Hər vaxt Müaviyyənin yanından qayıtdıqda, onun ağlını tərif edirdi. Bir dəfə isə onun yanından çox kədərli qayıtdı, hətta xörək də yemədi. Bizim üçün bir hadisə üz verdiyini və atamın valilikdən uzaqlaşdırıldığını fikirləşdim. Bir azdan dedim: Nə üçün bu gün tutqun və narahatsan? Dedi: İnsanların ən xəbisinin yanından gəlirəm. Bu gecə xəlvətdə Müaviyyəyə dedim: Sən öz arzuna çatmısan və daha qocalmısan, Bəni Haşim ilə ədalətlə rəftar etməyin yaxşı olardı. Onlar sənin qohumlarındır və daha onlardan .qorxun yoxdur

Müaviyyə dedi: Əbu Bəkr şahlığa çatdı, öldükdən sonra onun adı da aradan getdi. Onu yada saldıqda, Əbu Bəkr deyirlər. Ömər, on il zəhmət çəkdi, dünyadan getdikdən sonra onu yada saldıqda, Ömər deyirlər. Ondan sonra biz Bəni Üməyyənin qardaşı, Osman rəyasətə çatdı və heç kim nəsəbdə onun kimi deyildi, öldükdən sonra adı da .öldü

Amma, hər gün beş dəfə Mühəmmədin adını fəryad edirlər və deyirlər: Əşhədu ənnə Mühəmmədən rəsululah. Bununla nə etmək olar? And olsun Allaha, bu adı aradan (aparmasam sakit olmaram.(١

Bəli, Müaviyyə Peyğəmbərlə (s) düşmən olub və o həzrətin Allah verdiyi əzəmətini görmək istəmirdi. Bir



---

.Mürəvvicuz-zihab, Məsudi,.٣-cü cild, səh ۴۵۴-۴۵۵ [٢۴] -١

halda ki, Qür’an buyurur: و رفعنا لك ذكرك (Biz sənin adını sənin üçün ucaltdıq.)[1]

## Müaviyyə lənətə layiqdir

Eynul-Əimmə rəvayət edir ki, on dəlil ilə Müaviyyəyə lənət oxumaq olar:

1. Əmir-əl- möminin Əlinin (ə) itaətindən çıxmaq.

2. Əmir-əl-möminin Əliyə(ə) qarşı qarşı qılınc çəkmək.

3. Əmir-əl-möminin Əlinin (ə) haqqını qəsb etmək.

4. Əhli beyti (ə) inkar etmək.

5. Özünü imamlığa layiq bilmək.

6. Əmir-əl-möminin Əlinin (ə) fəzilətlərini gizlətmək.

7. Əmir-əl-möminin Əliyə (ə) minbərlərdə hörmətsizlik etmək.

8. Osmanın qanını o həzrətə böhtan atmaq.

9. Ümmətə hökumət etməyi kafir Yezidə tapşırmaq.

10. İmam Həsəni (ə) qətlə yetirmək və imam Hüseynin (ə) qətlini vəsiyyət etmək.

Bəs, Müaviyyə, şərtsiz olaraq lənətə layiqdir.[2]

## Cinayətkar Yezidi tanıyaq

Yezidin atası Müaviyyə, anası səhrada yaşayan Məysun, müəllimi Sərcun, rumlu bir xristian idi. Bəni Haşim və Peyğəbərin (s) əhli beyti ilə düşmənliyi ata və babalarından, cahiliyyət xürafatlarını, laqeyidliyi səhra qadını olan anasından, İslam və müsəlmanlarla düşmənliyi, xristian müəllimi Sərcundan öyrənmişdi.



---

۱- [۲۵] Şərh surəsi: ayə ۴-cü

Tarixə əsasən, Yezidin heç bir şəxsiyyəti və dinə əlaqəsi yox idi. Eyş-işrətdən və şəhvətdən başqa iş tanımırdı. O, üç illik hökuməti dövründə misli görünməyən cinayətlər etdi. Birinci il həzrət Hüseyn ibn Əlini (ə), övladlarını, qohumlarını və dostlarını faciəli şəkildə öldürdü, qadınları, uşaqları və Peyğəmbərin (s) əhli beytini şəhidlərin kəsilmiş başları ilə birlikdə şəhərləri dolandırdı. Hökumətinin ikinci ilində, Mədinə camaatını qılıncdan keçirdi, mal və namuslarını üç gün qoşununun ixtiyarında qoydu. Üçüncü ildə Müqəddəs Kə’bə evini dağıdıb, ona od vurdu.(١)

Rəvayət olunub ki, Mədinə hadisəsindən min nəfər ərsiz qadından zinadan yaranmış övlad dünyaya gəldi və onları Hərrə övladları adlandırırdılar. Başqa bir xəbərdə gəlib ki, əməvi hücumçuları Mədinədə min nəfər bakirə qızla zina etdilər. Peyğəmbərin (s) mənbərində oturub, özünü onun canişini adlandıran, hər bir hökmü, İslam hökmü kimi qəbul edilən Yezidin cinayətləri bir həddə çatdı ki, hətta Peyğəmbər (s) məscidində də zina edildi.

### Yezid düşmənçiliyin son həddində

İmam Hüseyni (ə) qətlə yetirdikdən sonra, bir gün Yezid, şərab məclisində oturmuşdu. İbn Ziyad da onun sağ tərəfində oturmuşdu. O, saqiyə dedi: Mənə sümüklərimin iliyinə nəş’ə verən bir cam şərab ver! Sonra ibn Ziyad üçün də belə bir şərab verilməsini əmr etdi. Yezid şərabı içir, onun artığını imam Hüseynin (ə) mübarək başına tökürdü. Yezid xeyzəran ilə həzrətin mübarək dodaqlarına



---

١- [٢٧] Yəqubi, ٢-ci cild, səh.٢١۶, ٢٢۴, ٢۴٣, Əbul Fəda, ١-ci cild, səh.١٩٠, ١٩٢, Müvərricuz-zəhəb, ٣-cü cild, səh.۶۴, ٨١.

və dişlərinə vurur, deyirdi: Hüseyn əcəb dodaqların və dişlərin var! Orada olanlardan birisi dedi: Yezid, sən bu işə necə cür'ət edirsən! Mən özüm, Allah Peyğəmbərinin (s) .Hüseynin (ə) dodaqlarından öpdüyünü gördüm

O, aşkarcasına Bəni Haşimdən qisasını aldığını deyirdi. Necə ki, əsirləri məclisdə görərkən dedi: Ey kaş, Bədrdə öldürülən adamlarım mənim bu işimi görəydilər və deyəydilər: Sağ ol Yezid, yaxşı bizim intiqamımızı Bəni Haşimdən aldın... Bəli, Yezid bu işi ilə fəxr edir və Bədrdə İslam dininə qarşı vuruşlarda öldürülən kafir və müşrik ata-babalarını bu işə sağ ol deməlırinə çağırırdı. Risalət ailəsinin əsirlər karvanı, Ceyrun məntəqəsində görsənərkən, Yezid qarğaların səsini eşitdi və bu şe'ri oxudu: Karvan göründüyü və o günəşlər Ceyrun təpəsinin üstündə saçdıqları vaxt, qarğalar səsləndilər. Onlara dedim: İstəyirsiz səs salın, ya sakit qalın, mən öz borcumu !Peyğəmbərdən (s) aldım

**Yezid lənətə layiqdir**

İbn Əqil deyir: Yezidin bizim əlimizə gəlib çatan bə'zi şerlərindən aydın olur ki, onu lənətləmək lazımdır. O, kafir və zındıq olub. O, şerlərində aşkar olaraq, Allahı inkar :etməyindən və özünün puç əqidəsindən dəm vurub. O cümlədən bu beytlərdir

Ey Aliyə, yaxın gəl, çal və oxu ki, doğrudan da mənim münacatdan, raz və niyazdan" xoşum gəlmir. Gəl və məni ətirli şərabla sirab et. O şərabdan ki, onu (bakirə) qızlar hazırlayıblar. Ey arvad, mən ölsəm, gecikmə, iddə saxlamadan tez ərə get. Mən istəyirəm məhşər günü əlimdə, sümüklərimi sirab edən sarı rəngli şərab tutduğum "!halda Mühəmmədlə görüşüm

Yezidin kafir olmasını təsdiqləyən sünnü alimlərindən, Qazi Əbuy Əli, Əhməd ibn Hənbəl, ibn Covzi,(۱) Keyahrəsi,(۲) Şeyx Mühəmməd Bəkri, Səid Təftazani(۳) və Sibt ibn Covzinin(۴) adlarını çəkmək olar.

Cahiz deyir: Yezidin mürtəkib olduğu günahlar: Hüseyni (ə) öldürməyi, Mədinə əhlini qorxuya salmağı, Kəbə evini dağıtmağı, Allah Peyğəmbərinin (s) qızlarını əsir etməyi, çubuqla Hüseynin (ə) dişlərinə vurmağı; bunlar onun qəsavətinə, pis fikrinə, kininə, inad və nifaqına dəlildir, ya onun ixlasını, Peyğəmbərə (s) məhəbbətini və o həzrətin şəriət və sünnəsini qorumasını göstərir?! Sonra davam edib, deyir: Hər halda bu işləri onun fisq və azğınlığını göstərir, o, fasiq və məl'undur, hər kəs də məl'unu lə'nətləməyin qarşısını alsa, o da məl'undur.(۵)

Alusi də yenə təkid edərək deyir: Yezidi lənətləməkdə özündə şəkkə yol vermə. Çünki, onun çoxlu nalayiq xüsusiyyətləri vardır və heç vaxt böyük günahlara mürtəkib olmaqdan çəkinməyib. Onun günahkar olması barədə, Məkkə və Mədinədə o qədər cinayətlər etməsi və imam Hüseyni (Allahın sələvat və salamı ona və onun cəddinə olsun) öldürməyə icazə verməsi, bu işdən aşkar razılığını bildirməsi və o həzrətin ailəsinə hörmətsizlik etməsi bəsdir. Bu xəbisin, Peyğəmbərin (s) risalətinə iman gətirməməsini güman edirəm. Hər halda Yezidin, Allahın



---

۱- [۲۸] Təzkirətul-xəvas, səh.۱۶۲.

۲- [۲۹] Vəfəyatul- ə'əyan, ibn Xəlkan.

۳- [۳۰] Əlsirətul-Hələbiyyə, ۱-ci cild, səh.۱۷۲.

۴- [۳۱] Təzkirətul-xəvas.

۵- [۳۲] Rəsailu Cahiz, səh.۲۹۸.

aman yerinin (Məkkə) sakinləri və Peyğəmbərin (s) əhli beyti və pak itrəti barəsində etdiyi cinayətlər (istər Hüseyn ibn Əlinin (ə) həyatı dövründə və istər onun şəhadətindən sonra) və başqa etdiyi cinayətləri, Qür’an vərəqlərini zibil arasına atmağından az deyildi. Mən, onun işlərinin müsəlmanlara gizli qalmış olmasını təsəvvür etmirəm. Amma onun zülmü dövründə yaşayan müsəlmanların səbr etməkdən başqa əllərindən bir iş gəlmirdi, belə ki, Allah Özü onun işini sona çatdırdı.(١)

İbn Cövzi deyir: Əhməd ibn Hənbəlin oğlu Saleh deyir: Atama dedim ki, camaat Yezidlə dostluğu, bizə nisbət verirlər. Atam dedi: Oğlum, bir kəsin Allaha imanı olması və bununla belə Yezidi də sevməsi necə mümkündür? Dedim, bəs niyə ona lə’nət oxumursan? Atam dedi: Oğlum, sən indiyə kimi mənim birinə lənət oxuduğumu görmüsən? Sonra artırıb, dedi: Allah öz kitabında lə’nət etdiyi bir kəsi, biz necə lə’nət etməyə bilərik?!

Dedim, Qür’anın harasında Yezidə lə’nət edib? Dedi: o yerdə ki, buyurur:

فهل عسيتم ان توليتم ان تفسدوا فى الارض وتقطعوا ارحامكم اولائک الذين لعنهم الله

Ey münafiqlər) Odur ki, sizdən İslamdan üz döndərəcəyiniz təqdirdə, yer üzündə) fəsad törətmək və qohumluq əlaqələrinizi tamamilə kəsməkdən başqa bir şey umulur?! Onlar, Allahın lənət etdiyi kəslərdirlər....(٢)



---

١- [٣٣] Ruhul-məani ٨-ci cild, səh.١٢٥. Bu mətləbdə və qabaqkı səhifələrdə, Şeyx Əli Rəbbaninin “Sitareyi dirəxşani Şam ” kitabından istifadə olunub.

٢- [٣۴] Mühəmməd surəsi : ayə٢٢-٢٣

(Sonra atam dedi: Adam öldürməkdən böyük hansı fəsad ola bilər?(١)

Ömrü boyu heç kimə lə’nət oxumayan Əhməd ibn Hənbəl də Qür’ana əsaslanaraq, .Yezidə lə’nəti vacib bilir

**(Həzrət Rüqəyyə (ə**

**Həzrət Rüqəyyənin (ə) ziyarətnaməsi**

السّلام عليك يا سيدتنا رقيه عليك تحيه والسّلام و رحمه الله وبركاته السّلام عليك يا بنت امير المؤمنين علىّ ابن ابى طالب السّلام عليك يا بنت فاطمه الزّهرا سيده نساء العالمين السّلام عليك يا بنت خديجه الكبرا امّ المؤمنين و المؤمنات السّلام عليك يا بنت ولىّ الله

اسّلام عليك يا اخت ولى الله اسّلام عليك يا بنت الحسين الشّهيد اسّلام عليك يا ايتها الصّدّيقه الشّهيده اسّلام عليك ايتها الرّضيه المرضيه السّلام علِيك ايتها التّقيه النّقيه اسّلام عليك ايتها الزكيه الفاضله اسّلام عليك ايتها الْمضلومه البهيه صلّى الله عليك و على روحك و بدنك فجعل الله منزلك ومأواك فى الجنّه مع آبائك واجدادك الطيّبين الطّاهرين المعْصومين السّلام عليكم بما صبرتم فنعْم عقْبى الدّار و على الملائكه الحافّين حول حرمك الشّريف و رحمه الله و بركاته و

səh:٢٠

---

.Təzkirətul-xəvas, ibn Cövzi, səh.١۶٢ [٣۵] -١

صلّى الله على سيّدنا محمّد و آله الطّيّبين الطاهرين برحمتک یا ارحم الرّاحمین

**...Şiə aləminin böyük mərcəyi–təqlidi**

Şiə aləminin böyük mərcəyi-təqlidi həzrət ayətullah Mirzə Cavad Təbrizinin həzrət .Rüqəyyənin hərəmində bəyanatı

Bu günün ən yaxşı əməllərindən biri ilahi hökmləri öyrənməkdən ibarətdir. Bildiyiniz kimi, çoxlu mövzular vardır ki, şöhrət vasitəsi ilə və heç bir başqa dəlilə ehtiyac olmadan sabit olur. Həmin cür ki, əgər bir şəxs, bir yeri, birinə satsa, lakin o yer camaat arasında vəqfi yer adı ilə tanınmış olsa, bu surətdə imam (ə) buyurur: əgər bu yer, camaat arasında vəqfi yer kimi şöhrət tapıbsa, onu almaq icazəli deyil və o yer gərək, öz sahibinə qaytarılsın. Buradan aydın olur ki, (bir şeyin isbat olmasında) şöhrət kifayətdir və başqa dəlilə ehtiyac yoxdur. Mina və Məş’ərin də hədlərini təyin etmək .belədir

Habelə, əgər bir şəxs ۲۰۰ il bundan qabaq, bir yerdə dəfn olmuş olsa və bu şəxsin ۲۰۰ il bundan qabaq dəfn olduğu yerdə bir kəs qalmasa ki, xəbər versin bu qəbr həmin seyidin qəbridir, lakin şöhrət onu tə’yin edibdir. Bu söz, həzrət Rüqəyyənin (ə) mütəhhər qəbrinə də şamil olur. Belə ki, həzrət Rüqəyyənin (ə) Şamda qəbri məşhurdur. Həzrət Rüqəyyənin varlığının hikməti və onun Şamda dəfni, din düşmənlərini rüsvay etməkdir ki, sonralar heç kəs Şam hadisələrini inkar edə bilməsin və həzrət Rüqəyyənin (ə) qəbri, qadınların bu müqəddəs məkanda

.əsir olmaqlarının əlamətidir. Daha heç bir kəs, Şam hadisələrini dana bilməz

Həzrət Rüqəyyənin (ə) qəbri, əhli beytə (ə) olunan zülmlərə canlı şahid, sənəddir. Şöhrət, Həzrət Rüqəyyənin (ə) qəbrinin varlığına dəlilidir və onun (ə) bu məkanda dəfni canlı bir əlamətdir. Ona görə də, o həzrətin qəbri və məqamı barəsində olan bəzilərinin şəkk və şübhələrinə əhəmiyyət vermək və diqqət etmək lazım deyil. Onlar, (həzrət Rüqəyyənin Şamda dəfninə və onun məqamına şübhə ilə yanaşanlar), şeytanın azdırdıqları şəxslərdir. Onlar, məsələlərə nadan və cahil olduqları üçün, həqiqətləri .dərk edə bilmirlər

Bu xanımın ziyarəti, mə’nəviyyat qazanmaqdır. Elə bir mənəviyyat ki, insana .azğınlıqlardan nicat verə bilər

.Hamınızı onun ziyarətinə təşviq edir və hamınıza düa edirəm

**Həzrət Rüqəyyənin (ə) ata və anası**

Həzrət Rüqəyyə (ə) imam Hüseyn ibn Əlinin (ə) qızıdır. Onun anasının adı Ümmü İshaqdır. Həzrət Rüqəyyə (ə) ۵۹-cu hicri qəməri ilində Mədinə şəhərində dünyaya gəldi və ۶۱-ci hicri ilində atası ilə birlikdə Kərbəlaya səfər etdi. Bəzi rəvayətlərə əsasən həzrət Rüqəyyənin şəhadəti zamanı üç yaşı var idi. O hicri-qəməri tarixi ilə ۵-i səfər ۶۱-.ci ildə Şam şəhərində əsirlikdə şəhadətə çatdı

səh:۲۲

Rüqəyyə; lüğətdə yuxarı və yuxarı aparmaq, tərəqqi etmək mənasınadır. Biz, İslamda bir neçə Rüqəyyə adı ilə rastlaşırıq ki, o cümlədən onlardan biri həzrət Xədicənin saxlayıb, böyütdüyü qızdır. O, hicrətdən iyirmi il qabaq Məkkədə dünyaya gəlmişdi və böyüdükdən sonra Ütbə ibn Əbi Ləhəb ilə izdivac etmişdi. Peyğəmbər (s), peyğəmbərliyə məb'us olandan sonra Rüqəyyə də Xədicə ilə birlikdə Peyğəmbərə (s) iman gətirdi. Təbbət yəda əbi Ləhəbin və təbb(۱) ayəsi nazil olduqdan sonra Əbu Ləhəb, oğlundan Rüqəyyəyə təlaq verməsini istədi. Ütbə də onu boşadı. Sonra o, ...Osman ibn Əffan ilə izdivac etdi. Amma

İslam və Peyğəmbərin (s) düşməni, Müğeyrə ibn Əbil As, Peyğəmbərə (s) ox atdığını və onun qolunu sındırdığını iddia edirdi. Osman ona pənah verdi. Sonra Peyğəmbərin (s) yanına gəlib, Müğeyrənin azad olmasını xahiş etdi. Peyğəmbər (s) buyurdu: Ona .getmək üçün, üç gün aman verirəm

Osman, Müğeyrənin vəsaitini və yol azuqəsini hazırlayıb, yola saldı. Amma, Müğeyrə yarı yolda getmək fikrindən döndü. Bu işi Mütəal Allah, öz Peyğəmbərinə (s) xəbər .verdi. Peyğəmbər (s), Zeyd və Zübeyri Müğeyrəni öldürmək üçün göndəri

Osman evə gəlib, Rüqəyyəni bu işdə təqsirləndirdi və onun bu işi Peyğəmbərə (s) xəbər verdiyini iddia etdi. Rüqəyyə bunu inkar etdi və bu işdən xəbəri olmadığını dedi. Amma Osman inanmadı və onu ağacla möhkəm



---

Məsəd surəsi [۳۷] -۱

döydü. O xanım, Peyğəmbərin (s) evinə qayıtdı və aldığı ağır yaraları nəticəsində .dünyadan getdi

Osman, Müğeyrə ibn Əbil Asın səfər vəsaitini hazırlayarkən, Peyğəmbər (s) buyurdu: (Allah lə’nət etsin o kəsə ki, ona (Müğeyrəyə) minik verdi və səfər vəsaitini hazırladı.(١)

Həzrət Əmir-əl-möminin Əlinin (ə) qızlarının da birinin adı Rüqəyyə idi. O, şücaətli və fəzilətli bir qadın idi. O, ilahi maarifi və İslam elmlərini, atasının və qardaşlarının yanında öyrənmişdi. Rüqəyyə, əmsi oğlu Müslüm ibn Əqil ilə izdivac etmşdi və bu izdivacdan iki övlad: Əbdüllah və Mühəmməd dünyaya gəlmişdi. Qardaşı imam Hüseyn (ə), Mədinədən Kərbəlaya səfər edərkən, o da iki oğlu ilə birlikdə imamla Kərbəlayə gəldi. Yolda əri Müslümin şəhadət xəbəri ona çatdı. O, ərinin və sonra Kərbəlada, qardaşlarının, övladlarının və başqa yaxınlarının şəhadətlərinə səbr etdi, sonra əsirlik .müsibətləri çəkdi və bacısı Zeynəblə (ə) birlikdə həmasələr yaratdılar

İmam Museyi Kazimin (ə) də Rüqəyyeyi Süğra adlı bir qızı var idi. O da atasının yanında böyümüş və ilahi elmləri, hədis və İslam maarifini öyrənmişdi. Rüqəyyeyi Süğra, əhli .beyt (ə) hədislərinin ravilərindən sayılır

### Həzrət imam Hüseynin (ə) Rüqəyyəyə (ə) məhəbbəti

Həzrət imam Hüseyn (ə), atası həzrət Əlini (ə) və anası Fatimeyi Zəhranı (ə) çox sevirdi. Ona görə də hər vaxt, Mütəal-Allah ona övlad əta etsəydi, əgər oğlan olsaydı, atası Əlinin (ə) və qız olsaydı, anası Fatimeyi Zəhranın (ə) adını o körpəyə qoyurdu. Sonra onları bir-birindən seçmək



---

Təvəlla və təbərra, Məalimül-zülfiidən nəqli ilə, səh.٣٣١ [٣٨] -١

üçün, hər birinə bir ləqəb verirdi. Həzrət Rüqəyyənin (ə) də adı Fatimə olub və imam (Hüseynin (ə) kiçik qızı olduğu üçün ona Fatimeyi Süğra ləqəbini verib.(١)

İmam Hüseyn (ə) həzrət Rüqəyyəni (ə) çox sevirdi və gecələr onu öz qucağında .yatızdırırdı

**Həzrət Rüqəyyənin (ə) ləyaqəti**

Kərbəla hadisəsi İslam dinini canlandıran, ona yenidən ruh verən, Qiyamətə kimi əbədi qalmalı və İslam dinini sapınmalardan qoruya bilməli olan, bir hadisə olmalı idi. Ona görə də bu hadisənin iştirakçıları ilahi insanlar olmalı, bütün müsibətlərə səbr edə bilən, Allahdan başqa heç bir qüdrət qarşısında baş əyməyən, təkcə Allaha təslim olub, həmişə Onun razılığına razı olan, hər harada olarlarsa, öz məntiqli söz və əməlləri ilə əsil İslam dinini, Peyğəmbəri (s) və əhli beyti (ə) insanlara tanıda və xalqı hidayət edə bilən şəxslər olmalı idilər. Ona görə də biz tarixdə çoxlu şəxsləri görürük ki, Kərbəla həmasəsində iştirak edə bilmədi və ya başqa sözlə desək, buna ləyaqətləri çatmadı. Amma həzrət Rüqəyyə (ə) üç yaşında olmasına baxmayaraq, bu işə layiq idi, necə ki, biz tarixdən buna şahidik. O həzrətin bərəkətindən, əhli beytin tanınmadığı və həqiqi İslamdan uzaq düşmüş, hətta möminlər ağası Əli (ə) məsciddə səcdə halında şəhadətə çatdıqda, camaatı məgər Əli (ə) namaz qılırdı ki, məscidə gedib deyilən belə bir yerlərdə, əhli beyti (ə) tanıdılar və həqiqi İslamdan xəbərdar oldular, əhli beytin (ə) məzlumiyyətinə göz yaşı tökdülər. İndinin özünə qədər minlərlə insan (hətta xristian və yəhudi), o həzrətin bərəkətindən İslama iman gətirmiş və əhli beytin (ə) aşiqi (olmuşdur. Camaatı məgər Əli (ə



---

Muntəhiyul-amal, ١-ci cild, Şeyx Əbbas Qumi [٣٩] -١

namaz qılırdı ki, məscidə gedib deyən bir şəhərin, məscidlərinin minarələrindən indi .Əşhədu ənnə mövlana Əmir-əl-mömininə Əliyyən vəliyulah kəlamı zəmzəmə olunur

## Həzrət Rüqəyyə (ə) Kərbəlada

### İmam Hüseynin (ə) həzrət Rüqəyyəyə (ə) sifarişi

Həzrət imam Səccad (ə) buyurur: Aşura gecəsi mən xəstə idim və bibim Zeynəb, mənə xidmət edirdi. Birdən atam bizdən uzaqlaşıb öz xeyməsinə getdi. Covn (Əbuzərin azad etdiyi qülam), imamla birlikdə idi və o həzrətin qılıncını təmir edirdi. Atam bu şeri :oxudu

يا دهر افّ لک من خليل كم لک يا لاشرلق و الاصيل

من صاحب و طالب قتيل و الدهر لا يقنع با لبديل

و انّما الامر الى الجليل و كلّ حى سالک سبيل

Ey dünya! Uff sənin dostluğuna, nə qədər dostları və sənin üçün çalışanları sübhlər və“ !gecələr öldürdün

Bəli, dünya onların yerinə başqasını istəmir. Doğrudan da işlərin sonu Cəlil olan Allahın ”.əlindədir və hər bir canlı gərək bu yoldan keçsin

Ürək yandıran bu şe’ri atamdan eşidərkən onun məqsədini başa düşdüm, böyük bir bəlanın nazil olduğunu və imamın şəhadəti qəbul etdiyini bildim. Ona görə də ağlamaq boğazımı tutdu, amma səbr edib səsimi ucaltmadım. Hərəm əhli və uşaqlar bu şe’ri eşidərkən ağlamaq və nalə səsləri ucaldı. Bibim həzrət Zeynəb (ə), qadın idi (və qadınlar ürəyi yumşaq olduqları üçün) özünü saxlaya bilmədi, ayağa qalxıb tez imamın yanına gedib dedi: Vay oğul ölən anam! Ey kaş mənim ölümüm çataydı və diri olmayaydım! Bu gün, anam Zəhra, atam Əli və qardaşım Həsən dünyadan getdikləri gündür! Ey

!qardaşım! Sən gedənlərin yadigarı və qalanların pənah yerisən

İmam Hüseyn (ə) ona baxıb buyurdu: Bacı, ayıq ol ki, şeytan sənin səbrini əlindən !almasın

Sonra yaş imamın mübarək gözlərində həlqə vurduğu halda bu atalar sözünü .buyurdu: Əgər Qəta quşunu azad buraxsaydılar, gecəni öz yuvasında yatardı

Həzrət Zeynəb (ə) dedi: Vay olsun mənə! Sənin heç bir çarən olmayıb və çarəsizlikdən ölümü qəbul etmisən, bu daha çox mənim ürəyimi yandırır və mənə çox çətindir. Məni !?qərib və tənha, zalım münafiqlərin arasında qoyursan

Həzrət Zeynəb, bu sözləri deyib öz üzünə sili vurdu və huşdan gedib yerə yıxıldı. İmam Hüseyn (ə) qalxıb bacısının üzünə su töküb onu huşa gətirdi. Sonra onu sakitləşdirib buyurdu: Bacı! Allahdan qorx və səbirli ol. Bil ki, yer əhli hamısı öləcək və göylərin sakinləri də əbədi deyillər. Həqiqətən Allahdan başqa hər bir şey həlak olacaq ki, O, bütün məxluqatı Öz qüdrəti ilə yaradıbdır və camaatı öldürüb, yenidən dirildəcək. Odur yeganə və misli, bərabəri olmayan. Cəddim, atam, anam və qardaşım, hamısı məndən yaxşı idilər. Onların hamısı dünyadan gedib və onunla vidalaşıblar. Yaxşıdır ki, mən və .hər bir müsəlman, Allah Rəsuluna (s) iqtida edək və onu özümüzə örnək qərar verək

İmam Hüseyn (ə) belə sözlərlə bacısına dildarlıq edib, buyurdu: Bacı! Səni and verirəm və sən gərək bu anda əməl edəsən. Mən şəhid olarkən, sinəni və üzünü cırma, mənim .şəhadətimdə vaveyla ilə fəryad etmə

İmam Səccad (ə) buyurur: Sonra atam bibim həzrət Zeynəbi mənim yanıma gətirib, orada oturtdu.(١)

İmam Hüseyn (ə) əziz bacısını sakitləşdirdikdən sonra, öz ailə-uşağının yanına getdi və onlara səbr etmələrini buyurdu. Sonra buyurdu:

يا اختا ه يا گلثم و انت يا زينب و انت يا رقيه و انت يا فاطمه و انت يا رباب ! انظرن اذا انا قتلت فلا تشـقـقن على جيبا و لا تخمشن على وجها و لا تقلن على هجرا

Bacı! Ümmü Gülsum! Və sən ey Zeynəb, sən ey Rüqəyyə, ey Fatimə, ey Rübab! Mənim sözlərimə qulaq asın. Mən şəhid olarkən yaxanızı və üzünüzü cırmayın, dilinizə pis sözlər gətirməyin!(٢)

### Aşura gecəsi həzrət Rüqəyyənin (ə) və başqa uşaqların susuzluğu

Həzrət Səkinədən (ə) rəvayət olub:

Məhərrəm ayının doqquzuncu günü bizim suyumuz qurtardı. Susuzluq uşaqlara çox tə’sir etmişdi. Bütün qabların və məşglərin suyu tamamilə qurumuşdu. Mən və başqa uşaqlar möhkəm susamışdıq. Uşaqların susuzluğunu xəbər vermək üçün bibim Zeynəbin (ə) xidmətinə getdim. Onun yanına çatdıqda südəmər qardaşımı qucağında saxladığını gördüm. Qardaşım Əli Əsğər gah oturur, gah qalxırdı, sudan uzaq düşmüş balıq kimi narahat idi və ağlayırdı.

Bibim Zeynəb ona deyirdi: Səbr elə qardaşımın balası! Bu qədər susuz olduğun halda necə səbr edəsən?! Bibin



---

١- [٤٠] Müntəhiyul-amal ١-ci cild.

٢- [٤١] Lühuf, Seyyid ibni Tavus

üçün nə qədər çətindir ki, sənin səsini eşidə, amma bunun sənin halına heç bir faydası .olmaya

Həzrət Səkinə buyurur: Mən bibimdən bu sözləri eşidəndə ağladım. Həzrət Zeynəb !?buyurdu: Səkinə

.Ərz etdim: Bəli

?Buyurdu: Nə üçün ağlayırsan

.Dedim: Qardaşım Əli Əsğərin susuzluğuna ağlayıram

.Daha ona özümün nə qədər susuz olduğumu demədim

Sonra bibimə dedim: Bibican, kaş dostların və ənsarın yanına gedəydin, bəlkə onların .xeyməsində su tapıla

O, Əli Əsğəri qucağına alıb, əmilərimin xeymələrinə getdi amma, onların da suyu .qurtarmışdı

Həzrət Rüqəyyə (ə) və başqa azyaşlı uşaqlar susuzluğun şiddətindən çox zəifləmişdilər, artıq taqətləri yox idi. Onlar da bizim ardımızca yola düşdülər. Bibim, əmim oğlanlarının (imam Həsənin (ə) övladlarının) xeyməsində oturdu və su tapmaq .ümidi ilə bir nəfəri səhabələrin xeyməsinə göndərdi

Amma onları da xeyməsində su tapılmadı. Su tapmaq ümidindən mə'yus olduqdan .sonra öz xeyməsinə qayıtdı. İyirmiyə yaxın azyaşlı uşaq onunla birlikdə idilər

Uşaqlar susuzluğun şiddətindən ağlayır, fəryad edirdilər. Biz də fəryad edirdik. Bu vaxt atamın dostlarından olan Büreyr, bizim ağlamaq səsimizi eşidib, özünü yerə vurdu və başına torpaq tökdü. Sonra öz dostlarına xitab edib, dedi: Bu qılınclar bizim əlimizdə olduğu halda, siz Fatimeyi Zəhranın (ə) qızlarının ölməyini istəyirsinizmi?! Yox! And olsun Allaha ki, bunlardan sonra yaşamağın heç bir xeyri yoxdur. Biz gərək Fatimeyi .Zəhranın (ə) uşaqlarından və qızlarından qabaq ölək

Ey mənim dostlarım! Bu uşaqlar susuzluqdan ölməmiş, bizim hər birimiz bu uşaqların

.hücum edək. Ömər Sə’din qoşunu bizimlə döyüşsələr, biz də onlarla döyüşək

Büreyrin dostlarından biri, Yəhya ibn Mazəni, dedi: Biz Fəratın keşikçiləri ilə döyüşsək, bu uşaqlara ox dəyə bilər və bunun səbəbi biz olarıq. Yaxşıdır ki, özümüzlə məşg götürək və onu su ilə dolduraq. Fəratın keşikçiləri bizimlə döyüşsələr, biz də onlarla .döyüşək və bizlərdən biri öldürülsə, həzrət Fatimeyi Zəhra (ə) qızlarına fəda olsun

.Büreyr dedi: Bu yaxşı fikirdir

Onlar dörd nəfər olub, hər biri əlinə bir su məşgi götürüb, suya tərəf getdilər. Fəratın .keşikçiləri onlara dedilər: Siz kimsiniz? Özünüzü tanıdın ki, biz başçımıza xəbər verək

Büreyr və onların başçılarının arasında qohumluq var idi. Bu xəbəri ona verəndə dedi: .Onlara yol verin, su içsinlər

Büreyr və dostları Fərat çayına daxil oldular. Suyun sərinliyin və soyuqluğunu hiss edərkən ağladılar və dedilər: Allah lənət etsin Ömər Sə’də. Bu axar sudan bir qətrə .belə, Mühəmməd (ə) övladları içə bilmirlər

Büreyr dedi: Öz arxanıza baxın və tez su götürün. Çünki, Hüseynin (ə) uşaqlarının ürəkləri susuzluqdan yanır. Həzrət Fatimeyi Zəhranın (ə) övladları su içməyincə siz su .içməyin

Büreyrin dostları dedilər: Ey Büreyr: And olsun Allaha, Hüseynin (ə) uşaqları bu sudan .içməyincə, biz sudan bir qətrə olsun belə içmərik

Fərat keşikçilərindən bir nəfər bu sözləri eşidib, dedi: Sizin özünüzün Fərata daxil ?olmağınız bəs deyil, bu xaricilər üçün də su aparmaq istəyirsiniz

.Büreyr ona dedi: Bizim işimizi gizli saxla

Sonra Büreyr yaxın gedib, onu tutdu ki, başqalarına xəbər verməsin. Amma o kişi qaçıb onların işini öz

başçılarına xəbər verdi. Başçı dedi: Onları tutub mənim yanıma gətirin! Əgər gəlmək !istəməsələr, onlarla vuruşun

Fəratın keşikçiləri Büreyr və onun dostlarının yolunu bağladılar. Onların arasında döyüş başladı. Büreyr onlara nəsihət etdi. İmam Hüseyn (ə) onun səsini eşidib, bir .neçə nəfəri köməyə göndərdi. Fəratın keşikçiləri qaçdılar

Büreyr və onun dostları su gətirdilər. Hüseynin (ə) susuzluqdan dodaqları qurumuş balaları suyun başına yığışdılar, qarın və sinələrini su məşginin üstünə qoydular. Birdən məşgin bağı açıldı və su yerə axdı. İmam Hüseynin (ə) övladlarının nalə və fəryadı ucaldı. Büreyr öz üzünə vurub dedi: Əfsus, həzrət Fatimeyi Zəhranın (ə) qızlarının (susuzluqdan yanan ciyərlərinə bu su yetişmədi!(١

### Həzrət Rüqəyyə Aşura günü

Bəzi rəvayətlərdə gəlib: Aşura günü həzrət Səkinə (ə), üç yaşlı bacısına dedi: -Gəl .atamızın ətəyindən tutaq və onu getməyə qoymayaq. Atamız getsə onu öldürəcəklər

İmam Hüseyn (ə) bu sözü eşidəndə bərk ağladı. Bu vaxt Rüqəyyə (ə) səsləndi: Ata sənin getməyinə mane olmaram, amma səbr elə səni görüm. İmam Hüseyn (ə) onu qucağına aldı və susuzluqdan quruyan dodaqların öpdü. Bu vaxt o nazdanə səsləndi: -Ata çox susuzam, susuzluq ciyərimə od vurub. İmam Hüseyn (ə) ona buyurdu: -Xeymə kənarında otur, mən gedib sənə su gətirim. İmam Hüseyn (ə) ayağa durub, meydana يا :tərəf getmək istədi. Rüqəyyə (ə) yenə də atasının ətəyini tutub, ağlaya-ağlaya dedi ?Atacan, hara gedirsən? Nə üçün bizdən ayrılırsanابه اين تمضى عنّا



---

.dastan əz kəramat və məsayib həzrət Rüqəyyə (ə) Əbbas Əzizi ٢٠٠[۴٢] -١

İmam (ə), bir də o balanı qucağına aldı və sakitləşdirdi. Sonra qana dönmüş ürəklə ondan ayrıldı.(۱)

### .Ata, bizi Mədinəyə qaytar

Kərbəla hadisəsindən və əhli beytin (ə) əsirliyindən sonra, bir gün Yezid, Şimrdən soruşdu: Sən Kərbəlada idin, Hüseynin (ə) halına ürəyin yanan bir vaxt oldu?

Şimr dedi: (Neçə yerdə mənim ürəyim Hüseynin halına yanıb) Ürəyimi yandıran hallardan biri də bu zaman idi ki, imam Hüseyn (ə) son vidasında xeymənin qapısının kənarına gəldi. Balaca qızı, qolunu onun boynuna saldı. O, “vay atacan ” deyə qışqırdı və elə fəryad etdi ki, bütün aləmin ürəyini yandırdı.

Hüseyn (ə), bu vaxt başını aşağı saldı və gözlərindən yaş axdı. O uşaq Hüseynə (ə) deyirdi: «Atacan, bizi Mədinəyə qaytar!»(۲)

### Ata dayan, qoy səni doyunca görüm

İmam Hüseyn (ə) hərəmləri ilə vidalaşıb, onlardan arxayın olduqdan və yaralarını bağladıqdan sonra döyüş meydanına yola düşdü. Bir qədər yol getmişdi ki, bu vaxt bir balaca qız, o həzrətin arxasınca qaçdı. İmam, qızın nə dediyini eşitmək üçün qulaq asdı. O qız belə deyirdi: Sənə mane olmaq istəmirəm, bir xahişim var.

يا ابه ! مهلا توقف حتّى اتزود من نظرى اليک

Ata! Yavaş get, dayan, qoy səni doyunca görüm.

İmam Hüseyn (ə) dayandı, o balaca qızı qucağına aldı və ona təsəlli verib, sakitləşdirdi.(۳)



---

۱- [۴۳] Həzrət Rüqəyyə (ə), Şeyx Əli Fəlsəfi, səh.۵۵۰.

۲- [۴۴] Nehzəti Hüseyni ۱-ci cild, səh.۱۲۴.

۳- [۴۵] Məvaizi Şuştəri, səh.۱۴۰.

### İmam Hüseynin (ə) Həzrət Rüqəyyə (ə) ilə son vidası

Düşmən əsgərlərindən biri olan, Hilal ibni Nafe deyir: Mən ön sıralarda dayanmaşdım. Gördüm, imam Hüseyn (ə), öz əhli beyti ilə vidalaşdıqdan sonra meydana tərəf gəlir. Bu vaxt bir balaca qız, xeymədən çıxdı, titrək addımlarla qaça-qaça imam Hüseynin (ə) ardınca gəldi və özünü o həzrətə çatdırdı, onun ətəyini tutub, səslədi: Atacan mənə bax! Mən susuzam! Ürək yandıran bu sözləri susuz bir uşağın dilindən eşitmək, imam Hüseynin (ə) yaralı ürəyinə duz səpmək kimi idi. Onun sözləri imam Hüseynə (ə) elə təsir etdi ki, ixtiyarsız gözlərindən yaş axdı. Yaşla dolu gözlərlə o qıza dedi: الله يسقيك فانه Qızım sənin susuz olduğunu bilirəm. Allah səni sirab etsin. Çünki o mənim vəkilim وكيلى və pənah yerimdir.

Hilal deyir: Mən bu qızcığazın imam Hüseynin (ə) nəyi olduğunu soruşdum. Mənə cavab verdilər ki, o imam Hüseynin (ə) üç yaşlı qızı, Rüqəyyədir.

### Səccadənin kənarında atasının yolunu gözləyirdi

Həzrət Rüqəyyə (ə) hər namaz vaxtı atasının səccadəsini sərərdi və o həzrət onun üstündə namazını qılardı. Aşura günü zöhr, yenə adəti üzrə atasının səccadəsini sərib, intizarla oturdu. Amma bir müddətdən sonra birdən Şimrin xeyməyə daxil olduğunu gördü.

Rüqəyyə (ə) ondan soruşdu: Mənim atamı görməmisən? Şimr səccadənin kənarında atasının yolunu gözləyən qızı görən kimi öz qulamına dedi: Bu qızı vur! Qulam bu göstərişə əməl etmədi. Şimr özü qabağa gəlib, o nazdanənin surətinə belə sili vurdu ki, Allahın ərşi titrədi.

### Atasının susuzluğunu biləndə su içmədi

:İbn Covzinin Məfatihul-ğeyb kitabında gəlib

Saleh ibn Əbdullah deyir: Xeymələrə od vurulan zaman, əhli beyt (ə) biyabanlara üz qoydular. Paltarının ətəyi od tutmuş bir balaca qızı gördüm. Qorxusundan ağlayır və qaçırdı. Mənim onun halına rəhmim gəldi. Libasının odunu söndürmək üçün, atı ona tərəf çapdım. Atın nəfəsini eşidən kimi iztirabı artdı. Ona dedim ki, qorxma, səni incitmək istəmirəm. O, çarəsiz olaraq qorxusundan dayandı. Atdan yerə enib, libasının odunu söndürdüm. Birdən o qız soruşdu: Dodaqlarım susuzluğun şiddətindən quruyub, mənə bir içim su ver. Bu sözü eşidəndə ürəyim yumşaldı, qabı su ilə doldurub ona verdim. Suyu alıb, bir ah çəkdi və ahəstə yola düşdü. Soruşdum: Hara getmək istsyirsən? Buyurdu: Bir kiçik bacım var ki, o məndən də susuzdur. Dedim: Qorxma, suyun qadağası götürülüb, siz için. Dedi: Səndən bir sualım var. Atam Hüseyn (ə) susuz :idi, ona su verdilər, ya yox?! Dedim: Yox, and olsun Allaha, ta axıra kimi buyururdu Mənə bir içim su verin. Amma su verən olmadı, hətta onun cavabını da اسقونی شربه من الماء .vermədilər

.O qız, bu sözü eşidərkən suyu içmədi

(Bə’ziləri bu qızın həzrət Rüqəyyə (ə) olduğunu deyirlər.(١

### Suyu atama aparmaq istəyirəm

Rəvayətdə gəlib: Ömər Sə’din qoşunu imam Hüseynin (ə) xeymələrinə od vurarkən iyirmi üç uşaq xeymədən çölə qaçdılar. Onlar susuzluğun şiddətindən və qorxularından .titrəyirdilər



---

.Həzrət Rüqəyyə (ə), Şeyx Əli Fəlsəfi[۴۶] -١

Xeymələrin qarətindən və onlara od vurduqdan sonra, Ömər Sə’din qoşun böyüklərindən biri ona dedi: Bunları Yezidin yanına belə aparmaq fikrindəsənsə, bir nəfəri də Şama gedib çıxmaz. Göstəriş ver, bunlara su versinlər. Bunlar susuzluqdan ölürlər. (hətta uşaqlardan bir neçəsi susuzluqdan ölmüşdü)[1]

Ömər Sə’d dedi: Uşaqlara su verin!

Suçular su məşglərini su ilə doldurub, uşaqlara və qadınlara apardılar. Onlar suyu əldən-ələ ötürərək, uşaqların arasında ən kiçiyi olan həzrət Rüqəyyəyə (ə) verdilər. Həzrət Rüqəyyə (ə) su qabını alıb, qətligaha tərəf yola düşdü.

Ona dedilər: Hara gedirsən?

Həzrət Rüqəyyə dedi: Atam döyüş meydanına gedəndə dodaqları susuzluqdan qurumuşdu. İstəyirəm bu suyu ona aparım, içsin.[2]

#### Həzrət Rüqəyyə (ə) şami qəribanda atasının cənazəsi kənarında

Şami qəriban gecəsi həzrət Zeynəb (ə), yarısı yanmış bir xeymədə azca yuxuladı. Yuxuda anası Fatimeyi Zəhranı (ə) gördü. Ərz etdi: Anacan, bizim halımızdan xəbərin varmı?!

Həzrət Fatimeyi Zəhra (ə) buyurdu: Eşitməyə taqətim yoxdur. Həzrət Zeynəb ərz etdi: Bəs dərdimi kimə deyim?

Fatimeyi Zəhra (ə) buyurdu: Oğlum Hüseynin (ə), başını bədənindən ayırdıqları vaxt, mən özüm orada idim. İndi ayağa qalx və Rüqəyyəni (ə) tap. Həzrət Zeynəb (ə) ayağa qalxdı və nə qədər səsləsə də Rüqəyyədən (ə) bir xəbər səh:۳۵

---

۱- [۴۷] Məaliyüs-sibtin, ۲-ci cild, səh.۸۹.

۲- [۴۸] Səməratul-həyat, ۲-ci cild, səh.۱۶.

olmadı. O, Ümmü Gülsümlə ağlayıb nalə etdilər və Rüqəyyəni (ə) axtarmağa başladılar. Nəhayət, qətligahın yaxınlığından onun səsini eşitdilər. Parə-parə olmuş bədənlərin yanına gəldilər, gördülər Rüqəyyə (ə) özünü atasının pak cənasi üstə atıb .və əllərini atasının sinəsinə yapışdırıb, ürək dərdlərini deyir

Həzrət Zeynəb (ə) onu nəvaziş etdi. Bu vaxt Səkinə (ə) da gəldi və birlikdə xeyməyə qayıtdılar. Yolda Səkinə (ə) Rüqəyyədən (ə) soruşdu: Atanın bədənini necə tapdın? O, cavab verdi: O qədər ata, ata sələdim ki, birdən atamın səsini eşitdim ki, buyurdu: .Buraya gəl, mən buradayam

Yatdı qoşun kəsildi səs, sayə çəkildi dövrədən

Çıxdı Rüqəyyə xaricə, nisfi şikəstə(۱) xeymədən

Başı açıq, ayaq yalın, caməsi(۲) köhnə pirəhən

Qətligəhə tərəf qaçır, yel kimi titrəyir bədən

?Hər qədəm ağlayır deyir: hardasan ay baba Hüseyn

***

:Guşeyi-qətligahidən birdən eşitdi bir səda

Gəzmə bu qanlı ərsəni, sinəmin üstə gəl bala

(Cəzb edib aşinasını ləhni- sədayi-aşina(۳

(Xaneyi-eşqidən işıq sate olurdu bərməla(۴

Oldu çirağı-nur ilən ol qıza rəhnəma(۵) Hüseyn

***

Tapdı nişani-nur ilən məqtəl ara babasını

Gördü çuxur məkanidə qan bürüyüb yarasını

---

Yarısı dağılmış[۴۹] -۱

Geyimi[۵۰] -۲

Tanış səs[۵۱] -۳

Gur işıq saçılırdı [۵۲] -۴

Yol göslərən [۵۳] -۵

Açdı yaralı şəh iki bazuyi-həqnəmasini(١)

Sinəsinə yapışdırıb doxtəri-binəvasini(٢)

Nisgil ilə dedi o qız: canüvə mən fəda Hüseyn!

***

Harda idin qoşun gəlib xeyməni yandıran zaman

At qabağında qızları çöldə dolandıran zaman

Mə’cərü-guşivaridən(٣) ötrü qovub yoran zaman

Rəxtimizi(۴) soyan zaman, qəmçi ilə döyən zaman

Vermədin, eylərəm giley, naləmizə səda Hüseyn

***

Bir də məriz qardaşım, od tutub odlanan zaman

Vurdu bibim özün oda, xeymə alovlanan zaman

Damənim od tutub mənim şölə çəkib yanan zaman

Əmmələrim, anam, bacım qol-qola bağlanan zaman

Səs niyə vermədin hamı sələdi onda ya Hüseyn!

***

Etmə Rüqəyyəcan giley, mən niyə dadə gəlmədim

Qərq idi xaki-xunidə(۵) nəşim aradə gəlmədim

Köynəyimi apardılar, sinə qoşadə(۶) gəlmədim

Nazir idim o halizə nuki-cidadə(٧) gəlmədim

Qovzanıb istədim gələm, atlar ayağı qoymadı

Tutdü məni çuxur yerin qanlı qucağı qoymadı

Qəlbidə növcəvanımın suzişi-daği qoymadı

Nizə, qılınc sınıqları kəsdi qabaği qoymadi

Oldu bu seyri-rahidə manei-mübtəla(١) Hüseyn

***

(İndi öpüm icazə ver surəti-şəms-təl'əti(٢)

Sən də müqabilində qoy surətimə o surəti

Çək o mübarək əllərin başimə, qıl məhəbbəti

Pak elə zülfümün tozun, sən bil anamın hörməti

Ta bu yətimə doxtərin xatiri xoş ola Hüseyn

***

Yoxdu başım Rüqəyyəcan, ta öpəsən cəmalimi

(Ya ki, qoyam o surətə surəti por məlalimi(٣)

Yoxdu bədəndə əllərim gör bu şikəstə halimi

(Başuvə əl çəkəm siləm, zülfi-çəmən misalini(۴)

Yoxsa edərdi xahişin şövqilə cabeca(۵) Hüseyn

***

Yatma bu qanlı sinədə, dur, bala get, Rüqəyyəcan

Əmmələrin gəzir çöli sinə xəraşü(۶) bağrı qan

Ərsədə rəddi-payuvi(۷) dərk edib axtarır nişan

?Gör necə səs gəlir deyir: nazlı Rüqəyyəm hardasan



---

۱- [۶۱] Yol boyu mübtəla edən maneələr

۲- Günəş kimi parlayan surət, üz

۳- [۶۳] Əzab-əziyyət görmüş surət

۴- [۶۴] Çəmənə bənzər zülf

۵- [۶۵] Yerbəyer

۶- [۶۶] Sinə dağlı

۷- [۶۷] Ayaq izlərini

!Bir də deyirlər qıl kömək bizlərə ya əxa Hüseyn

***

Ey yaralı Hüseynimə doxtəri-nazidanə(١) gəl

Başı bəlali bülbülüm, boş qalıb aşiyanə gəl

Bu gecə aləmi səni saldı çölə zəmanə gəl

Lə'l kimi boyanmısan başdan-ayağə qanə gəl

Zülfüvə xuni sorx(٢) ilə vermiş əcəb cəla(٣) Hüseyn

***

(Gəldiyi yoldan ol xanım istədi ric'ət eyliyə(۴

Əmmələrin gəzib tapa, ya gedə parə xeyməyə

Qorxdu itirdi düz yolu, düşdü vücudi lərzəyə

Bir Nəcəfə tərəf baxıb, bir də səvadi(۵)-Kufəyə

Gəl yolumu itirmişəm, ol mənə rahnəma Hüseyn

***

Zülməti şəb(۶) hərəsnak(٧), əmmələri gəzir çölü

Bir qız uşağı nabaləd, ərsə tikan ilən dolu

Oxdu, qılıncdı, nizədi, qanlı cənazə sağ-solu

Əmmələrin gəlir səsi, leyk tapammayır yolu

Nazir idi o qəmfəza aləmə bərməla Hüseyn

***

?(Əhli əza! kim elədi bəs o qıza dəlaləti(۸

səh:۳۹

---

۱- [۶۸] Nazlı qız

۲- [۶۹] Qızıl qan ilə

۳- [۷۰] Bəzək

۴- [۷۱] Qayıda

۵- [۷۲] Kufə tərəfindən görünən qaranlığa

۶- [۷۳] Gecə zülməti

۷- [۷۴] Qorxulu

۸- [۷۵] Yol göstərmək, bələdçilik

(Getdi mənim əqidəmə, şəmsi-həyavü-möhənəti(١)

(Yəni anası Fatimə tapdı o morği möhnəti(٢)

Əmmələrinə əlbəəl verdi həmən əmanəti

Hifz edələr ki, Şamidə salim ala onu Hüseyn

Salam olsun sənə ey ata! Səndən sonra necə müsibətlər çəkdim. Sənin ayrılığından və şəhadətindən sonra qərib və tənhayam.

Əsirlər aparılan məntəqələrin birində, Əba Əbdillah Hüseynin (ə) qızı məhmildən yerə düşdü. İmam Hüseynin (ə) başını aparan nizədar deyir: Birdən nizəm yerə girdi. Nə qədər çalışdımsa, onu yerdən çıxara bilmədim. Dedim: İmam Səccaddan (ə) soruşun, görün nə olub ki, nizə yerə batıb, çıxmır. Xəbər imam Səccada (ə) çatdı. Həzrət buyurdu: Bibim Zeynəbin xidmətinə gedin və ondan soruşun ki, nə olub? Həzrət özü də gəlib buyurdu: Bibi, atam demək istəyir ki, bacı, əsirləri say, gör qardaşının balalarından yerdə qalan olmayıb?

Həzrət Zeynəb, bu sözü qardaşının yadigarından (imam Səccaddan ə) eşidən kimi, Ümmü Gülsümün yanına gəlib dedi: Bacı qardaşımın balalarından biri yoxdur, gəl onu axtaraq tapaq. Hərəsi bir tərəfə yollandılar və çağırırdılar: Bibin sənə qurban haradasan? Niyə cavab vermirsən? Amma cavab eşidilmirdi.

Bu vaxt, qaranlıqda onlara tərəf gələn bir qaraltı gördülər. O, zəif və titrək səslə ağlaya-ağlaya atasını çağırır və deyirdi: Ata, ata hardasan, niyə qızının fəryadına çatmırsan? Onlar nazdanəni görən kimi ona tərəf qaçdılar, qucaqlarına aldılar. O nazdanə, atasının kəsilmiş başına xitab edib deyirdi: Ata, ata elə ki, naqədən yıxıldım,



---

١- [٧۶] Möhnət və ismət, həya günəşi

٢- [٧٧] Qəmli quşu

fəryad edirdim. Bir nurani və əzəmətli xanım gəlib, mənə kömək etdi. Ona ürək sözlərimi dedim. Ona dedim, mən Hüseynin (ə) qızıyam. Mənə qəmçi vurdular, mənə sili vurdular. Ata, o əzəmətli xanım çox mehriban idi, məni qucağına aldı, nəvazişlə başımi əl çəkdi, mənə dildarlıq edib dedi: Qəm yemə, qafiləyə çatacaqsan. Bu mehribanlığı ondan görəndə dedim: Bibi ayaqlarima bir bax, o qədər tikanlar üstə qaçmışam, yaradır. O xanım bu sözləri məndən eşidəndə dedi: Ürəyimin yaraları üstə .duz səpmə

O nurani və əzəmətli xanımın neçə əlaməti var idi: biri, surəti nili idi, ikinci, qəddi .əyilmişdi, üçüncü, bir əlini qabırğalarına tutmuşdu

## Ata bibimi vururlar

Əhli beyt (ə) əsirlərini məhmillərə mindirmək istərkən, Ömər Sə'd qoşununa, qadınları və uşaqları məhmillərə mindrməyi əmr etdi. Amma imam Səccad (ə), o qeyrətullah və vəliyullah acıqla səsləndi: Ey Ömər, qoşununu geri çağır. Bu qadın və uşaqlar özləri bir-birlərini məhmilə mindirərlər, naməhrəm gözlər onları görməməlidir. Ömər Sə'd, qoşununa fəryad çəkdi: İsmət və təharət əhli beytinin (ə) hərimindən uzaq olun, onlar özləri bir-birlərini məhmillərə mindirsinlər. Naməhrəmlər uzaqlaşan kimi Zeynəb (ə) və Ümmü Gülsüm (ə), qadın və uşaqları məhmillərə səvar etdilər. Axırda özləri qaldı, onlar dayanıb, bir-birlərinə baxdılar. Zeynəb (ə) dedi: Bacı, Ümmü Gülsüm (ə) gəl mən sənə kömək edim, səvar ol. Ümmü Gülsüm (ə) dedi: Bəs sənə kim kömək edəcək? Bibi Zeynəb (ə) dedi: Bacı sən səvar ol, mən də səvar olacağam. Ümmü Gülsüm (ə) səvar ?oldu və bacısına üz tutub dedi: İndi necə səvar olacaqsan

Bacım, Ümmü Gülsüm, məni Mədinədən bura gətirən, özü səvar edəcəkdir. Sonra o, nəhri-Əlqəmə(١) tərəf üz çevirib, qardaşı Əbbası səslədi: Qardaşım Əbbas (ə)! Sən, qeyrət sahibi idin və sən məni məhmilə mindirib izzət və cəlal ilə gətirmişdin. İndi yenə səvar olmaq vaxtıdır, qalx, məni məhmilə səvar et. Çünki, Zeynəbin (ə) onu məhmilə səvar etməyə daha heç kimi yoxdur. Sonra qətligahə tərəf gedib, qardaşı Hüseyni (ə) səslədi: Hüseyncan, bacın getmək istəyir. Qardaş qalx, bacını məhmilə səvar et. Amma Hüseyncan, öz əlimdə deyil, məni sənin yanından məcbur aparırlar. Həzrət Zeynəb, özünü Hüseynin parə-parə olmuş bədəni üstə atmışdı və son vidanı edirdi. Bu vaxt Hüseynin nazdanəsinin səsi eşidildi: Ata, ata yerindən qalx gör, bibimi taziyanə ilə vururlar. يا ابتاه انظر الى عمتى المضروبه

### Qətligahda, ata qucağında

Ali Mühəmməd (s) əsirlərini, şəhidlərin pak və müqəddəs bədənlərinin yanından apararkən, onların hər biri özünü, öz əzizinin cənazəsi üstə atdı və son dəfə olaraq öz şəhiidləri ilə vidalaşdı. Hüseynin (ə) nazdanəsi atasının bədənini ağuşuna çəkib, səsləyirdi: Ata, ata nə üçün mənimlə danışmırsan? Ata bir bax, bizi əsir aparırlar. Bu vaxt kufəlilər gəlib, taziyanə ili onları vuraraq, müqəddəs bədənlərdən ayırdılar. Əba Əbdillah Hüseynin (ə) nazdanəsi, atasının bədənini qucaqlamışdı və onunla söhbət edirdi. Kufənin kinli zalımları onu nə qədər çəkirdilərsə də ayıra bilmirdilər və taziyanə ilə vururdular. O səsləndi: Ata məni taziyanə ilə vururlar, bədənim



---

١- Fərat çayına[٧٨]

qaraldı. O vaxt atasının qucağından ayrıldı. Həzrət Rüqəyyə atasını qucaqladığı bir .halda onu atasından ayırdılar

**Həzrət Rüqəyyənin (ə) atasına şikayəti**

Rəvayət olub: Həzrət Rüqəyyə (ə) imam Hüseynin (ə) qana qərq olmuş bədəninin kənarında oturdu. O, gah atasının çiynindən tutub öpür, gah atasının barmaqlarını ürəyinin üstünə qoyur və gözlərinin üstünə çəkirdi. Rüqəyyə (ə) atasının qanını :götürür, öz üzünə və tüklərinə çəkirdi. O, deyirdi

.Ey ata! Sənin ölümün şəmatət edənlərin gözlərini işıqlandırdı və düşmənləri sevindirdi

.Ata! Bəni Üməyyə uşaq yaşımda yetimlik paltarını mənə geyindirdilər

Atacan! Gecənin qaranlığı çökərkən mən kimə pənah aparım? Əgər susuzlasam kim ?mənə su verəcək

Atacan, bizim pozulmuş saçlarımıza, qəmli ürəklərimizə, taziyanə ilə döyülmüş bibimə .və əsir olunmuş anama bax

Sonra həzrət Rüqəyyə (ə) buyurdu: Ey camaat! Bu gün getmək istəyirsinizsə, gedin və bu qadınları da özünüzlə aparın, amma məni atamın yanında qoyun. Çünki, mən kiçik bir uşağam və dəvəyə minməyə taqətim yoxdur. Mənimlə yaxşı rəftar edin və atamın qana qərq olmuş bədəninin yanında tənha qoyun ki, göz yaşlarımla və nalələrimlə .atamın müsibətində əzadarlıq edim. Bu halda ölsəm də qanım sizin boynunuza olmaz

Daşürəkli düşmənlərdən biri, zorla həzrət Rüqəyyəni (ə) atasının pak bədəni üstündən qaldırdı. Rüqəyyə (ə) məzlumcasına atasının parə-parə olmuş bədəninə pənah apardı .və o bədənə yapışdı. Amma o kafir, həzrət Rüqəyyəni (ə) çəkib, atasından uzaqlaşdırdı

:Həzrət Rüqəyyə (ə) atasının parə-parə olmuş bədəninə xitab edib, dedi

Atacan! Səndən sonra gecə olarkən kim məndən himayət edəcək və məni qoruyacaq, ?keşiyimi çəkəcək

.Ey mehriban ata! Düşmənlər mənim sırğamı və libaslarımı qarət etdilər

?Ey ata! Bizim örtüksüz başlarımıza və yanmış ciyərlərimizə baxmırsanmı

Ey ata! Bibim, həzrət Zeynəbə, baxmırsanmı ki, düşmənlər onu taziyanə ilə nə qədər ?döyüblər

(Ravi deyir: Onun bu nalələri bütün gözləri ağlatdı.(١

**Həzrət Rüqəyyə (ə) Şamda**

**İşarə**

Yezidin qoşunu əsirləri və müqəddəs başları Şamın yaxınlığına gətirdilər və Şama dörd fərsəx qalmış dayandılar. Onlar məqsədlərinə çatdıqları üçün şadlıq edirdilər. Yezidə namə yazıb, əsirləri və müqəddəs başları gətirdiklərini və şəhərə daxil olmaq üçün .onun əmrini gözlədiklərin xəbər verdilər

Əhli beytin (ə) halı çox ağır idi. Onlar Yezid ilə necə üzləşəcək və onun şəmatətlərinə, ?dil yaralarına necə dözəcəkdilər

Qasid, Yezidin yanına çatanda, o xəbis məl'un alnına dəsmal bağlamışdı və ayağını teştdə isti suya qoymuşdu, həkim də onu müalicə etməyə məşğul idi. Bir dəstə Bəni Üməyyə məclisdə oturub söhbət edirdilər. Qasid dedi: Gözün aydın, düşməninin başı şəhərə daxil oldu. Yezid məclis əhlini aldatmaq üçün zahirdə dedi: Sənin gözün aydın olmasın. Sonra göstəriş verdi ki, onu zindana



---

.dastan əz kəramat və məsayib həzrət Rüqəyyə (ə), Əbbas Əzizi, səh.۱۳۷ ۲۰۰[۷۹]-۱

salsınlar. Sonra Yezid əmr etdi ki, əhli beyti (ə) üç gün həmin yerdə saxlasınlar, ta şəhəri bəzəmək işi sona çatsın. Sonra əmr etdi ki, cəvahir və qiymətli daş-qaşlardan onun üçün tac və taxt düzəltsinlər, sərkərdələr, başçılar, və şəhərin ağsaqqalları saraya yığılsınlar, şəhər camaatı qoca və cavan, kişi və qadın, fəqir və varlı, gözəl və qiymətli libaslar geyinsinlər, qadınlar özlərinə zinət versinlər və bəzənsinlər. Heç kəs evdə qalmasın. Hamı çalğı aləti götürsün, təbillər çalsınlar, rəqqaslar oynasınlar. Əsirləri cəmiyyət çox olan məhəllə; Saət darvazasından gətirsinlər və şəhidlərin başını əsirlərin önündə gətirsinlər, əməvilər və yəhudilər yaşayan mərkəzlərdən keçirsinlər ki, darul-imarəyə çatan yol bir az uzaq olsun və bu məntəqələrin camaatı daha çox tə'nə vura bilsinlər(١).

Əhli beyti (ə) şəhidlərin kəsilmiş başları ilə birlikdə, içəri daxil olmağa icazə alana qədər Yezidin qəsrinin yanında saxladılar. Əvvəl, imam Hüseynin (ə) başını aparmağa məmur olan Zəcr ibn Qeys məl'un, icazə istədi və Yezidin yanına getdi. Sonra İmam Hüseynin (ə) əhli beytini boyun və ayaqlarında zəncir olan halda Yezidin məclisinə gətirdilər. İlahi, taqətim kəsildi, bu nə müsibətdir. Ya imam Səccad! Ya Zeynəb! Ya Rüqəyyə(!)

Əhli beyt (ə) məclisə daxil olarkən, Yezid məl'un bu şeri oxudu: Biz, Bədr döyüşündə öldürülənlərimizin sayı qədər, onların böyüklərini öldürdük.

Şəhidlərin müqəddəs başlarını Yezidin məclisinə gətirərkən, şəhidlər sərvəri həzrət imam Hüseynin (ə) mübarək başını qızıl teştdə Yezidin qarşısına qoydular. Bütün ömrünü şərab içməkdə keçirən Yezid, bu halda da



---

١- [٨٠] Riyazul-qüds.

.yenə şərabın məsti idi və öz düşməninin başını görəndə sevindi

Əlbəttə, həzrət Zeynəb (ə) öz məntiqli xütbəsi ilə Yezid və bütün yezidpərəstləri rüsvay etdi və əhli beyti (ə) onlara tanıtdırdı, hətta belə ki, bütün məclis əhli imam Hüseynin (ə) məzlumiyyətindən xəbərdar olub, ağladılar və bəziləri, hətta Yezidin öz arvadı, Yezidin əleyhinə qalxdılar, axırda Yezid rüsvay olduğunu görüb, bu işi öz boynundan atıb, ibn Ziyadı bu işdə təqsirləndirdi. (Sonrakı səhifələrdə Həzrət Zeynəbin ((ə) Yezidin məclisindəki xütbəsini gətirəcəyik

## Ən ağır müsibətlər

Rəvayət olub ki, imam Səccaddan (ə) soruşdular: Kərbəla səfərində sizə ən ağır .Şam, Şam, Şam الشام الشام الشام :müsibətlər harada oldu? Həzrət buyurdu

Başqa bir rəvayətdə gəlib, imam Səccad (ə), Nöman ibn Münzər Mədainiyə buyurdu: Biz Şama daxil olduğumuz zaman zaman çəkdiyimiz müsibətdən ağır müsibət görmədim. Çünki, biz yeddi müsibətlə üzləşdik ki, əsirliyin əvvəlindən axırına qədər :belə müsibət olmamışdı

Məmurlar Şamda bizim ətrafımızı yalın şəmşirlər və nizələrlə dövrələmişdilər və – ۱ nizənin kəəbi ilə bizi vururdular. Onlar bizi cəmiyyətin arasında saxlamışdılar, saz və .təbil çalır, şadlıq edirdilər

Şəhidlərin başlarını nizələrdə bizim qadınların arasında saxladılar və əmim Əbbasın – ۲ (ə) başını, bibilərim Zeynəb (ə) və Ümmü Gülsümün (ə) gözü önündə saxladılar və qardaşım Əli Əkbərin, əmim oğlu Qasimin başını, Səkinə və Fatimənin gözü önünə gətirdilər. Başlarla oynayırdılar və bəzən o başlar yerə düşür və atların ayaqları altında .qalırdı

Şamın qadınarı evlərin üstündən bizim başımıza od və su tökürdülər. Od - ۳ əmmaməmə düşdü, amma mənim əllərimi boynuma bağladıqları üçün onu söndürə .bilmədim, əmmaməm yandı, od başıma çatdı və başımı da yandırdı

Gün çıxandan, gün batmağa az qalana qədər bizi saz və avazla, camaatın gözü - ۴ qarşısında küçə və bazarlarda gəzdirdilər və deyirdilər: Bunları öldürün, çünki İslamda .heç bir hörmətləri yoxdur

Bizi dəvələrdən yerə endirdilər və hamımızı bir kəndirə bağladılar. Sonra yəhudi və -۵ nəsranilərin evlərinin önündən keçirir, onlara deyirdilər: Bunlar, ataları sizin atalarınızı (Xeybərdə və b...) öldürən və evlərini viran edənlərdilər. Bu gün siz onların intiqamını .bunlardan alın

يا نعمان فما بقى احد منهم الا و قد القى علينا من التراب و الحجار و الخشاب ما اراد

.Ya Nöman, onların hamısı istədikləri qədər torpaq, daş və ağacla bizə tərəf gəldilər

Bizi qul bazarına apardılar, qul və kəniz yerinə satmaq istədilər. Amma, Allah bu işdə -۶ .onlara imkan vermədi

Bizə təvanı olmayan bir yerdə mənzil verdilər. Gündüzlər istidən, gecələri isə - ۷ (soyuqdan, aclıqdan və öldürülməyin qorxusundan həmişə vəhşət və iztirabda idik.(۱

**Ahu balası**

Ali Məhəmməd (s) əsirlərinə səqfi olmayan və divarları uçmaq üzrə olan bir xarabada yer verdilər ki, bu vasitə ilə səh:۴۷

---

.Bax: Təzkirətuş-şühəda, Molla Həbibullah Kaşani, səh.۴۱۲[۸۱] -۱

.onların işgəncələri çox olsun, heç bir asayiş və əmniyyətləri olmasın

Bir gün Əba Əbdillah Hüseynin (ə) balaca qızı xaraba kənarında əyləşmişdi. Bu vaxt əlində ahu balası aparan bir ovçunu gördü. Ahunu istəyirəm, bəhanəsi ilə ağlamağa başladı. Şamlılar ovçunun ətrafını dövrələdilər və onu almaq üçün hərəsi bir qiymət deyirdi. Beləliklə, ahunun qiyməti həddindən çox yuxarı qalxdı. Şamlılar bu işləri ilə əhli beyt (ə) əsirlərini aciz göstərmək istəyirdilər. Bu vaxt, imam Səccad Zeynul-Abidin (ə), ovçuya baxıb, onun qarşısındakı torpaqdan bir ovuc götürdü və ovçuya verdi. Ovçu, onu imam Səccadın (ə) əlindən aldı və baxanda torpğınq qiymətli cəvahirata çevrildiyini gördü. Ovçu imamdan bu kəraməti müşahidə edərkən, ahu balasını Əba Əbdillah Hüseynin (ə) nazdanəsinə verdi. O, bazarda camaata deyirdi ki, imam Səccad (ə) gözümün qabağında bir ovuc torpağı qiymətli cəvahirata çevirdi. Ey camaat, bu imam Səccadın (ə) möcüzəsidir. Bu xəbər dildən-dilə düşərək, Yezidin sarayına çatdı. Yezid, ovçunun boynunun vurulmasını əmr etdi. Ovçunun öldürülmək xəbəri imama .çatdıqda, həzrət onun qəbrinin kənarına gəldi və Allahın istəyi ilə onu diriltdi

**...!Əssəlamu ələykə ya əbəta**

Haris Şami deyir: Bir gecə neçə nəfərlə imam Hüseynin (ə) əhli beytinə keşikçi idik. O gecə, Peyğəmbər (s) övladlarına xarabada yer verdilər və imam Hüseynin (ə) pak .başını xaraba yaxınlığında olan bir ağacın budağından asmışdılar

Səhərə yaxın vaxtlar idi. Gördüm, balaca bir qız, qadınların arasından çölə çıxdı. Heç kim görməsin deyə, yavaş-yavaş ağaca tərəf gedirdi. Məndən başqa, keşikçilərin hamısı yuxuya getmişdilər. Özümü yatmışlığa

vurdum və bir söz demədim. O qızın hara getmək istədiyini bilmək istəyirdim. O balaca qız, neçə dəfə qorxa-qorxa başa tərəf gəlib, geri qayıtdı. Amma axırda özünü ağacın :altına çatdırdı və yerə oturub, səslədi

يا ابتاه! و افرقتاه بعد فراقك

.Atacan! Aman uzaqlıq və ayrılıq əlindən

.O qız atasının başına baxır, onunla danışır və ağlayırdı

Bu vaxt imam Hüseynin (ə) başı aşağı endi və o qızla üz-üzə dayandı. Həzrət Rüqəyyə :(ə) atasının başına xitab edib, dedi

السلا م عليك يا ابتاه! وا مصيبتاه بعد فراقك وا غربتاه بعد شهادتك

Salam olsun sənə atacan! Sənin ayrılığından sonra, vay qəm və qüssədən. Sənin .şəhadətindən sonra, vay qəriblikdən

:Sonra yenə xitab etdi

يا ابتاه! اسرونا و هتكوا حرمتنا و احرقوا خيامنا و نهبوا اموالنا واشهرنا و رطبوا و قيدنا و الان حبسونا فيما تراه

Atacan bizi əsir etdilər, bizə hörmətsizlik etdilər və xeymələrimizə od vurdular. Bizi .zəncirə bağladılar. İndi də bizə xarabada yer veriblər

İmam Hüseynin (ə) balaca qızı bu sözləri dedikdən sonra bir fəryad çəkib, huşdan .getdi

Haris deyir: Əzim Allaha and içirəm ki, mən gördüm, o ağacın budağı əyildi, imam Hüseynin (ə) mübarək başı, balaca qızının üzünə çatdı. Onu öpürdü və təsəlli verir, buyururdu: Ey gözlərimin nuru! Səbr et, çünki, bizə yetişən bəlalara görə, .günahkarların şəfaəti bizimlədir

Sonra imam Hüseynin (ə) mübarək başı buyurdu: Qızım! Əsirliyin çətinlikləri, yolun işgəncələri və sənin müsibətlərin sona çatdı. Sən, neçə gecədən sonra mənim

(yanıma gələcəksən. Şəfaət məqamı sənə nəsib olmaq üçün əziyyətlərə səbr et.(١)

Haris Şami deyir: Mənim evim Şamın xarabasının yaxınlığında idi. Gözləyirdim ki, görüm, o qız uşağı atasının dediyi kimi bu yaxınlarda dünyadan gedəcəkmi? Gecələrin ?birində Şamın xarabasından nalə və fəryad səsi eşitdim. Soruşdum: Nə xəbərdir

(Dedilər: Həzrət Rüqəyyə (ə) dünyadan gedibdir.(٢)

### Həzrət Rüqəyyənin (ə) şəhadəti

İmam Hüseynin (ə) üç yaşlı nazdanəsi gecələrin birində aləmi-röyadə atasını görür. O xanım, yuxudan ayılıb atasını yanında görmədikdə ağlamağa başlayır. Ondan ağlamağının səbəbini soruşurlar, cavabında deyir: Atam haradadır? Mənim atamı, gözümün nurunu gətirin. Onlar bildilər ki, nazdanə atasını yuxuda görüb. Nə qədər təsəlli versələr də sakitləşdirə bilmədilər. Əhli beyt (ə) özləri də elə ağlamağa bəhanə axtarırdılar. Ona görə də gecənin sükutunu sındırıb, hamılıqla o qıza qoşulub, ağlamağa, nalə etməyə başladılar, öz üzlərinə sili vurub, saçlarını pərişan etdilər və başlarına torpaq tökdülər. Onların ağlamaq səsi o qədər ucaldı ki, lənətə gəlmiş .Yezidin qulağına çatdı

Tahir ibn Əbdillah Dəməşqi deyir: Mən Yezidin (Allahın lə’nəti olsun ona) nədimi idim və çox gecələr onun üçün söhbət edib, başını qarışdırırdım. Bir gecə də yenə o məl’unun yanında idim. Gecədən bir qədər keçmişdi. Mənə dedi: Ey Tahir! Bu gecə vəhşət mənə -qələbə edib, ürəyim döyünür, qüssə və hüznlə dolub. O qədər qəm



---

.Səmərətul-həyat, ٢-ci cild [٨٢] -١
.Riyazul-quds, ٢-ci cild [٨٣] -٢

qüssəliyəm ki, oturmağa və söhbət etməyə taqətim yoxdur. Gəl başımı ətəyinə al və mənim keçmişimdən, pis işlərimdən danışma. Tahir deyir: Mən onun nəhs başını ətəyimə aldım. O məl'un yuxuya getdi. O vaxt, şəhidlər sərvəri, həzrət imam Hüseynin (ə) nurani başı qızıl teştdə bizim qarşımızda idi. Bir saatdan sonra imam Hüseynin (ə) hərəmlərinin xarabadan nalə səsləri ucaldı. Yezid məl'un yuxuda, mən isə qüssədə !?idim ki, bu nə zülmüdür, Yezid, Əbu Türab övladlarına etdi

Teştə tərəf baxıb gördüm, imam Hüseynin (ə) gözlərindən yaş süzülür, təəccüb etdim! Sonra gördüm, o nurani baş, elə bil dörd zira' ( təqribən iki metr) yuxarı qalxdı və mübarək dodaqları hərəkətə gəldi, o möcüzəli ağzından qəmli və zəif bir səs ucaldı, İlahi, bunlar mənim övladlarım, ciyərlərimdir اللهم هئولاء اولادنا و اکبادنا و هئولاء اصحابنا:deyirdi .və bunlar mənim səhabələrimdirdlər

Tahir deyir: Mən bu halı o həzrətdən müşahidə etdikdə qorxuya düşdüm və məni dəhşət götürdü, ağlamağa başladım. Yezidin imarətinin üstünə gəldim. Əsirlər saxlanılan xaraba onun arxasında idi. Elə bilirdim ki, Rəsulullahın (s) əhli beytindən biri dünyasını dəyişib və onun ölümü onların bu nalələrinə səbəb olub. Qəsrin üstünə çatdıqda gördüm, əhli beyt hamılıqla bir balaca qız uşağını araya alıblar. O qız başına Ey bibi, ey atamın یا عمتی و یا اخت ابی این ابی این ابی:torpaq tökür, nalə və fəğan edib, deyir ?bacısı, atam haradadır, atam haradadır

Onları çağırıb, soruşdum: Nə olub ağlayırsınız, nalə edirsiniz? Dedilər: Şəhidlər sərvərinin qızı atasını yuxuda görüb, ayılandan bəri bizdən atasını istəyir. Nə qədər .təsəlli versək də, aram olmur

Tahir deyir: Mən bu dərdli halı müşahidə edəndə Yezidin yanına qayıtdım. O bədbəxt, Hüseyn ibn Əlinin (ə) başına tərəf baxır, qorxusundan öz-özünə söyüd yarpağı kimi titrəyirdi. Bu vaxt Hüseynin (ə) mübarək başı Yezidə tərəf baxıb, buyurdu: Ey Müaviyyənin oğlu, mən sənin haqqında nə pislik etmişdim ki, sən mənə bu zülmü etdin ?və əhli beytimə xarabada yer verdin

:Sonra o həzrət, Allaha üz tutub dedi

İlahi, Yeziddən mənə qarşı اللهم انتقم منه بما عامل بی و ظلمنی و اهلی و سیعلمم الذین ظلموا ایی منقلب ینقلبون !etdiyi rəftarın və əhli beytimə etdiyi zülmün intiqamını al

Yezid, bunu eşidərkən bədəni lərzəyə düşdü, az qaldı ki, bəndləri bir-birindən ayrılsın. Sonra məndən əhli beytin (ə) ağlamaqlarının səbəbini soruşdu və Hüseynin (ə) başını o qıza göndərib, dedi: Bunu görəndən sonra bəlkə təsəlli tapa. Keşikçilər o həzrətin başını götürüb, xarabanın qapısına gəldilər. Əhli beyt (ə) bildilər ki, imam Hüseynin (ə) müqəddəs başını gətiriblər, ona görə də hamılıqla o başı qarşılamağa çıxdılar və imam Hüseynin (ə) başını onlardan alıb, yenidən matəm tutdular. Məxsusən, Zeynəbi Kübra (ə) pərvanə kimi, o mübarək başın dövrəsinə dolanırdı. O balaca qız, mübarək başı görən kimi soruşdu: Bu kimin başıdır? Dedilər: Bu atanın mübarək başıdır. O qız, .atasının mübarək başını teştdən götürüb, bağrına basdı və ağlamağa başladı

Bir zibh(۱) olunan baş mənə mehman gəlib, əmmə

Dərmansız olan dərdimə dərman gəlib, əmmə

***



---

Kəsilən [۸۴] -۱

Əmmə, bu gecə külbəm(۱) olub rövzeyi-rizvan(۲)

Tarik(۳) evimi rövşən edib, təl’əti-canan(۴)

Məşuqə gərək aşiq edə, canını qurban

İndi edərəm canımı qurban, gəlib əmmə

***

İzzət mənə vermiş bu gecə, Xaliqi İzzət

Dünya boyunca etdi mənə lütf, inayət

Var məndə bibi gör necə iqbal və səadət

Peyğəmbərin oğlu mənə mehman gəlib əmmə

***

Min aləmilə bu gecə olmaz ola miqyas(۵)

Tofiqi-Xüdadır(۶) mənə bu ləhzeyi-həssas(۷)

Ey kaş bu baş ilə gəlirdi əmim Əbbas

Şəms(۸) ilə deyirdim məhi taban(۹) gəlib indi

***

Bu rə’si mütəhhər(۱۰) ki, edib külbəmi rövşən

Min bağı behiştlə əvəz eyləmərəm mən

Dillənmir, gəl bəlkə bibi dindirəsən sən

Göz açmır edib, qəlbimi şan-şan, gəlib əmmə

***

Bu rə’si mütəhhərdə bibi, nuri xuda var

Min dərdə bunun bir lə’əb-lə’lində(١) dəva var

Heyf olsun axır qanı, dodaqində yara var

Qannan gül açıb, ləbləri(٢) xəndan gəlib əmmə

***

Min kövsəri-canbəxşi-canan(٣) var dodağında

Kövsər nədi?! Min ruh, rəvan var dodağında

Əfsus! Səd(۴) əfsus ki, qan var dodağında

Bilməm kimə mehmandı, hardan gəlib, əmmə

***

Min canım ola, bu başa qurban edərəm mən

Hər qədri mənə naz edə, nazın çəkərəm mən

Açmır gözünü, açsa gözündən öpərəm mən

Öpdükcə gözündən deyərəm, can, gəlib əmmə

***

Dur, bəzmi əza(۵) qur bu başa, ağlıyaq əmmə

Bahəm(۶) baş açıb, sinəmizi dağlıyaq əmmə

Bir qarə gətir, yarəsini bağlıyaq əmmə

Çox yarəsi var, qaninə qəltan gəlib əmmə

***

Mən xəsteyi dərd-o-qəmi hicrandım(۷), əmmə



---

۱- [۹۵] Qanlı dodaqlarında

۲- [۹۶] Dodaqları

۳- [۹۷] Can baxş edən məşuqun xeyri

۴- [۹۸] Yüz

۵- [۹۹] Əza məclisi

۶- [۱۰۰] Birlikdə

۷- [۱۰۱] Qəm və hicrandan yorulmuşdum

Müddətdi bu viranədə giryandım(١), əmmə

Amma bu gecə mən çox hərasandım(٢), əmmə

Dildən apara bu qəmi canan gəlib, əmmə

***

Baxdıqca yanır xirməni can(٣) bu başa, əmmə

Bu baş ilə mən, ömrümü vururam başa, əmmə

Məndən ala bu yarəli baş, can gəlib, əmmə

***

Ey kaş düşüb aləmə od, aləmi yansın

Qəlbim kimi yansın dünyanı talansın

İnsafdı gör, bir belə baş qanə boyansın

Qanilə olub, surəti əlvan gəlib, əmmə

***

Mən talibi didari rüxi yar idim(٤), əmmə

Dərmansız olan dərdə giriftar(٥) idim, əmmə

Dərdim var idi qəlbdə, bimar(٦) idim, əmmə

İndi o həmən dərdimə dərman gəlib, əmmə

***

Gəl oxşayaq əmmə, bu başı zul-mənə(٧) xatir

Əşgilə(٨) yuyaq, qanı dodağından mənə xatir

Gəl bəlkə bibi, gözlərin açdı sənə xatir

Bəlkə sənə mehman bu ləbi ətşan(۱) gəlib, əmmə

***

Gəl qəmlə keçən günlərimi, san verim(۲), əmmə

Az ömridə çox dərdimə payan(۳) verim, əmmə

Gəl al qucağımdan bu başı can verim, əmmə

Bağla gözümü, mövsümi-hicran(۴) gəlib, əmmə

***

Bildim niyə bu yarəli gəlmiş mənə mehman

Tutdum o çuxur yerdə buna, şami-qəriban

(İstəyib o gecə zəhmətimə eyliyə cübran(۵

Tutsun qızına şami qəriban, gəlib, əmmə

***

Bu nohələri Ədlcu göz yaşiylə, əmmə

Yazdıqca yanıb, ahi şərər başilə, əmmə

Nə yoldaşla xoşdu, nə qardaş ilə, əmmə

(Hər yandan üzüb əl, bizə mehman gəlib, əmmə(۶

O balaca qız, atasının mübarək başını qucağına alıb, ürək sözlərini, qəmlərini, yol boyu düşərgələrdə çəkdiyi müsibətləri... o başa deyirdi və atasının məzlumluğuna ağlayırdı: Atacan, kaş mən sənə fəda olurdum və sənin səh:۵۶

۱- [۱۱۱] Dodaqları susuzluqdan qurumuş

۲- [۱۱۲] Sayım

۳- [۱۱۳] Son

۴- [۱۱۴] Hicran zamanı

۵- [۱۱۵] Əvəzini çıxa

۶- [۱۱۶] Əhəd Ədlcu Təbrizi

mübarək saqqalının qana boyanmasını görmürdüm. O məzlumə qız, dodaqlarını .atasının dodaqlarına qoyub, o qədər ağladı ki, axırda huşdan getdi

Höccətül-islam Sədrəddin Səmərətul-həyat kitabında, öz sənədi ilə birlikdə gətirib: Həzrət Rüqəyyə öz dodağını atası Hüseynin (ə) dodağına qoydu və o həzrət (imam Ey gözümün nuru, gəl mənə tərəf, mənim الیی الی هلمیی فانا لک با لانتظار :Hüseyn) buyurdu .gözüm sənin yolundadır

.Bu vaxt, gördülər həzrət Rüqəyyə (ə) dünyadan gedib

**...Gecə yarısı**

Şamın xarabasında gecə yarısı həzrət Rüqəyyə atasını bəhanə edir. Hamı yuxudan oyanıb, onun bərk ağladığı üçün bir yerə yığılırlar və o qızı araya alıb təsəlli verirlər. Lakin o qız heç cür sakitləşmir, atasını bəhanə edir və deyirdi: Elə indicə atam yanımda idi, məni dizinin üstə oturtmuşdu, başıma əl çəkib, nəvaziş edirdi. Bibican, o mənim üzümdən öpdü və mənə təskinlik verirdi. Bibican mən atamı istəyirəm, mən atamı ...istəyirəm

O qədər ata, ata dedi, ağlayıb, nalə etdi ki, onun ağlamaq səsi Yezidin sarayına çatdı. O məl'un gecə yarısı imam Hüseynin (ə) mübarək başını xarabaya aparmağı əmr etdi. Neçə nəfər mə'mur əllərində bir neçə şam tutaraq, başı teştə qoyub, üstünü örtərək .xarabaya gətirdilər

Nazdanə üzünü həzrət Zeynəbə (ə) tutub dedi: Bibi mən xörək istəmirdim, mən atamı ...istəyirəm

Bibi Zeynəb, dedi: Sənin istədiyin o örtüyün altındadır. Həzrət Rüqəyyə (ə) örtüyü qaldırdı, atasının qana boyanan kəsilmiş başını gördü və ürəyinin yarası təzələndi. Təkcə o qız yox, bəlkə hamısı bunu görəndə ağlayıb, şivən etdilər. Həzrət Rüqəyyə (ə) o başı götürdü, əvvəl onu iylədi və öpdü... Ata harada idin? Ata sən meydana gedərkən, alnın səh:٥٧

salamat idi, kim sənin nurani alnını sındırıb? O, atasının yaralanmış alnından öpdü. Ata ?saqqalın niyə qana və külə boyanıb

Sonra atasına giley etməyə başladı: Ata üzümə bax, bu göyərən yerlər düşmən silisinin yeridir. Ata, bədənimə bax, o qədar taziyanə vurublar ki, qaralıb. Ata ayaqlarıma bax, tikanla dolub. Ata təsəlli və nəvaziş əvəzinə, məni sili ilə sakitləşdirirdilər. O qədər ata, ata etdi ki, daha səsi kəsildi. Tarixə əsasən onun anası da xarabada idi. Anası gəlir, onu nə qədər çağırır ki, qızım, ürəyimin meyvəsi, qalx, amma daha Rüqəyyədən (ə) səs gəlmir. Nə qədər tərpədirlər, tərpənmir. Atasının başını sinəsinə almış halda, dünyanı .vida etmişdi

Sənsiz baba hər ləhzə işim ahi-fəğandı

Hər ləhzə vüsalın mənə min ləzzti-candı

Səndən olalı ağlamışam hər gecə-gündüz

(Şahid bu sözə gözdən axan əşki-rəvandi(١

Çox ağlamışam and ola öz canına baba

Əşgim qutarıb, gözdən axan dildəki(٢) qandı

Mən salmamışam damən vüsalın(٣) ələ asan

Bu vəslətə(۴) bais, o həmən ah, fəğandı

Çarə qəmi-hicranə tapam, nalədi gördüm

.Bildim ki, məni nalə bu qəmdən qutarandı

Etdim o qədər nalə inandım bu vüsalı

Bu vəsləti qəlbimdəki eşqim də inandı

Nalə gücünə qatil əlindən başın aldım

Yoxsa belə müşgül(۱), çətin asan olunandı

Gəlməzdi gümanım gecə yarı, gələ yarım

Yüz şükr ola Allaha, yatan bəxtim oyandı

Viranəyə xoş gəlmisən ey qibleyi-eşqim

Bu gəlməyin ilə başım, ərşə dayandı

Abad elədin külbəmi, olsun evin abad

(Viranə evim indi mənim rişki-cinandı(۲

Eşqində sənin hər qəm, hər möhnətə dözdüm

Aləmdə vəli ayrılığın dərdi yamandı

(Haşa, sənə şükuh(۳) edərəm kəsrəti-qəmdən(۴

Aşiq bilirəm atəşi-eşq ilə yanandı

Hərgiz, demirəm qalmışam ac, sevgilim, amma

Heç isti ğəza(۵) görməmişəm mən nə zamandı

Başın yuxuda çox gecə gördüm, dedim ey vay

Məndən qabaq ey vay səsimə əmməm oyandı

İndi ucadan ağlamaram, düşmən oyansın

?Şam əhli gəlib görsə deyərlər: bu babandı

Sinən güli bax gör haranı məskən edibdi

Axır nə deyim mən sənə ki, dərdim əyandı

Naçar olu viranəni məskən edər axər

.Bir quş ki, onun lanə-o-kaşanəsi(۶) yandı

Sani(۷) anamı, Zəcr məni vurdu yol üstə



---

Çətinlik [۱۲۱] -۱

Cənnətə həsrət çəkən [۱۲۲] -۲

Giley, şikayət [۱۲۳] -۳

Qəmin çoxluğundan [۱۲۴] -۴

Yemək, xörək [۱۲۵] -۵

Yurd və yuvası [۱۲۶] -۶

Ömər [۱۲۷] -۷

Zəhra nənəmin dərdi mənə indi ə’yandı

Zəhrayə dəyən sili mənə dəydi yıxıldım

Od tutdu üzüm Şamə kimi yandı ki, yandı.

Su verdilər içdin, de görüm, ya susuz öldün?

Qurbanə verəllər su, bu mərsumi-cahandı[1].

Bu parçalanan başın öpüm mən harasından?

Yox saf yeri başın, başə-baş yarədi qandı

Çoxdur yara başındə, məni bir yaran amma

Çox yandırır, alnından axan ləxtəli qandı.

Bildim, niyə əmməm başını Kufədə yardı

Qan axdı başından üzünə qanə boyandı

Hətmən bu alnında olan yarəni gördi

Vurdu başını məhmilə başdan yaralandı.

Alnın yaralıdı bilirəm, kərb və bəladən[2]

Dillən görüm axər bu dodağında nə qandı

Bir kəlmə danış, heç mənə yox, əmməmə xatir

Məndən də çox əmməm, dodaqundan nigərandı

Ey vay mənə bir busə yeri yox dodağında

Dərdin mənə gəlsin, bu nə dəndandı[3], dəhandı[4]?!

Qoy bir də dodağından öpüm canımı çıxsın

Hər bir öpüşün qiyməti minlər belə candı

Bir busə də ver əmməmə qanlı dodağından

(Hicrində nə müddətdi bibim əşgi-fəşandı(۵

Dərdin qocaldıb əmməmi, başın qəm ağardab

(Aç gözlərini, necə gör qəddi kəmandı (۶



---

Cahanda qaydadır, adətdir [۱۲۸] -۱

Qəm və bəladən [۱۲۹] -۲

Diş [۱۳۰] -۳

Ağız [۱۳۱] -۴

Göz yaşı tökür [۱۳۲] -۵

Əhəd Ədlcu Təbrizi [۱۳۳] -۶

Bədənə bədənə qüsl verib, kəfənə bükmək üçün ğəssalə gətirdilər. Bədəni qüsl və kəfən üçün hazırladılar. Qadınlar və uşaqlar bu səhnəni müşahidə edərkən, nalə və şivən səsləri ucaldı. Ğəssalə, həzrət Rüqəyyənin (ə) bədənini görən kimi qüsl ?etməkdən əl çəkib dedi: Bu əsirlərin başçısı kimdir

?Həzrət Zeynəb (ə) buyurdu: Nə istəyirsən

?Ğəssalə dedi: Bu qız hansı xəstəliyə tutulmuşdu ki, bədəni belə qaralıbdır

Həzrət Zeynəb (ə) buyurdu: Ey ğəssalə, o xəstə deyildi. Bu qaralan yerlər düşmənlərin .taziyanələrinin və zərbələrinin yeridir

Hamılıqla ağlamağa başladılar. Ğəssalə qadın da nazdanənin zəif və yaralı bədənini .yuyarkən gözlərindən yaş axırdı

Əhli beyt (ə) Şamdan Mədinəyə qayıdarkən Şamın qadınları qara geyərək, onları yola salırdılar. Hər tərəfdən onların nalə və ağlamaq səsləri gəlirdi və əhli beyt (ə) ilə vidalaşırdılar. Zeynəbi Kübra (ə) bu fürsətdən çoxlu istifadələr etdi: o cümlədən, vida vaxtı, birdən başını gəcavədən çölə çıxartdı və xitab etdi: Ey Şam əhli, bu xarabada bizdən bir əmanət qalıb. Hər vaxt onun qəbrinin kənarına getsəniz (o bu diyarda .qəribdir) məzarının üstə su səpin və qəbrinin kənarında çıraq yandırın

### Şamlı qız

Ali-Mühəmməd (s) əsirləri nəhayət, Şama çatdılar. Bir əsirlər ki, hamısı ərlərini və cavanlarını əldən vermiş qadınlar, qardaşlarını itirmiş bacılar, atalarını itirmiş qızlardırlar. Onlar müsibətlər görüblər, işgəncələr və əziyyətlər çəkiblər, dil yarası eşidiblər, yol yorğunluğu

onları əldən salıb, təsəlliyə, dildarlığa və təskinliyə ehtiyacları var. Şam şəhərinə daxil olurlar. Təsəlli əvəzinə dəf, tənbur, əl çalma və rəqslə onları qarşılayırlar. Dil yaraları ilə ürək yaralarının üstünə duz tökürlər. Evlərin üstündən onların başına toz-torpaq, kül tökürlər. Onlara döşəməsi və çırağı olmayan, təvanı olmayan və divarları uçmaq üzrə .olan bir xarabada yer verdilər

Bir gün həzrət Əba Əbdillah Hüseynin (ə) qızı xaraba kənarında oturub çölə tamaşa edirdi ki, bəlkə bununla dərd və əziyyətlərindən azala. Şam əhlindən olan, az yaşlı bir qız gəlib, Hüseynin (ə) qızının yanında oturur və onunla söhbət edir. Şamlı qız, o nazdanədən bir neçə sual soruşur; o cümlədən soruşur: Niyə çöhrən göyərib? Niyə üzün saralıb? Niyə bu qədər zəif və gücsüzsən? Niyə ayağın tikanla doludur və yaralıdır? O belə suallar soruşduqca Rüqəyyə (ə), yol boyu başına gələn macaraları ona danışırdı. Düşərgələrdə onlara verilən yeməyin çox az olmasından, yol boyu ona nə qədər sili vurmaqlarından, atasının necə şəhadətə çatmasından... o şamlı qıza .danışırdı

O gün keçir. Səhər, günortadan sonra, şamlı qız yenə xarabaya gəlir və əsirlərdən nazdanəni soruşub deyir: O surəti göyərmiş, ayaqları yaralı və tikanla dolu, aclığın şiddətindən rəngi saralmış və çox zəifləmiş qız, haradadır? Ona dedilər ki, sənin ?onunla nə işin var

.Şamlı qız dedi: Dünən o başına gələnlərdən və çəkdiyi çətinliklərdən mənə danışdı

Şamlı qız yenə soruşur: Bu əlamətlərlə dediyim qız haradadır? Amma cavab eşitmir. :Qadınlardan biri irəli gəlib dedi

,O qız ki, deyirsən ayağı tikanla dolu idi

,O qız ki, deyirsən çox zəif idi

,O qız ki, deyirsən sənə deyib, acam

O qız ki, sənə deyib, bədəni döyülməkdən qaralıb, ey şamlı qız, o, dünən gecə can verdi və atasının yanına getdi. (Deyirlər, o şamlı qız öz şam yeməyini də yeməyib, (Rüqəyyəyə (ə) gətirmişdi

Ürəkdə dərdə edib, əşgilə müalicəni

Xiyali-vəsli-Rüqəyyəylə(١) yatıb, ol gecəni

Deyərdi öz-özünə bu sözü, edərdi fəğan

Bu necə zülmidi dünya, səni xərab olasan

(Yatım mən necə gecəni həriri-bəstərdə(٢

Bilirəm indi yatıb Rüqəyyə, quru yer üstə

Qəmilə aləmi-imkani(٣) dağlayır indi

Üzün qoyub quru torpağə ağlayır indi

Gecə keçib səhər oldu, durub o xırdaca qız

(Edibdi qəlbidə şəmi-məhəbbəti əfruz(۴

Götürdü hissə-təamı(۵), qəlbi dincəldi

Çıxıb şitab(۶) ilə xərabəyə gəldi

Məraminə yetişib, rəxti-firqəti(٧) soydi

Yetişdi mənzili-viraniyə qədəm qoydi

Həmin o vəqtidə qəlbin əza oxu yardı

Görüb xarabadə qəmli bir mənzərə vardı

۱- [۱۳۴] Rüqəyyəni görmək ümidi ilə

۲- [۱۳۵] İpək yataqda

۳- [۱۳۶] Dünyanı

۴- [۱۳۷] Məhəbbət şamını şöləli ləndirdi

۵- [۱۳۸] Yemək payını

۶- [۱۳۹] Tələsik

۷- [۱۴۰] Ayrılıq libasını

Cəfa daşıyla şikəst oldu(١), şişeyi-səbri

Alıb araya xanımlar balaca bir qəbri

Xanımlara o zaman bir-bə-bir nəzər saldı

Hezar(٢) heyf ola qəlbində həsrəti qaldı

Düşübdü heyrətə etdi təəccüb öz-özünə

Nə qədri baxdı, Rüqəyyə dəymədi gözünə

(Yanıbdı qəlbi o dəm həsrət-ehtiraqilən(٣

Dayandı Zeynəbi məzlumənin qabaqində

Sipehri-qəmdə(۴) dedi, tutqun ulduz axtarıram

Rüqəyyə adlı xanım, nazlı bir qız axtarıram

Onunla dildə mənim sirli söhbətim vardı

O xırdaca xanıma bir əmanətim vardı

Toxandı tiri-bəla(۵) qəlbi-zarini(۶) dəldi

:Həmin o vəqtidə Zəhra qızı dilə gəldi

Əbü-cəfalər(٧) saldı Rüqəyyəmi candan

Ürəkdə nisgilinə əmməsi ola qurban

Keçən gecə ürəyin tiri-qəmlə(٨) böldü balam

.Qiyamətə kimi yannam, acından öldü balam

səh:۶۴

---

Sındı [١۴١] -١

۲- [۱۴۲] Min

۳- [۱۴۳] Həsrət odu ilə

۴- [۱۴۴] Qəmli göydə

۵- [۱۴۵] Bəla oxu

۶- [۱۴۶] Qəmli ürəyin

۷- [۱۴۷] Çox cəfa edənlər

۸- [۱۴۸] Qəm oxu ilə

### Həzrət Rüqəyyənin (ə) şəhadəti Şam əhlini qəflət yuxusundan ayıldır

Şamın xarabasında həzrət Rüqəyyənin (ə) ürəkyandırıcı şəhadətindən sonra əhli beyt (ə) xanımları əzadarlığa və ağlamağa məşğul oldular. O gün, Şam şəhərinin bütün küçələrindən ağlamaq səsi eşidilirdi. Artıq Şam əhli qəflətdən ayılmış, Peyğəmbəri Əkrəmin (s) əhli beytinin məzlumiyyətindən agah olmuşdular. Onlar bazarları tə'til etdilər və Ali-Əbaya (ə) əza saxladılar. Şam əhli deyirdilər: And olsun Allaha, biz o başın Hüseyn ibn Əlinin (ə) başı olduğunu bilmirdik. Bizə o başın, Yezid əleyhinə çıxmış, bir nəfər xaricinin başı olduğunu demişdilər. Camaatın xəbərdar olması xəbəri Yezidə çatdıqda, o, Qür'an cüzvələrinin məsciddə camaata paylanmasını əmr etdi ki, camaat namazdan sonra Qür'an oxusunlar, bəlkə bununla imam Hüseyni (ə) onların yadından çıxara bilə. Amma daha heç bir şeylə imam Hüseyni (ə) camaatın yadından çıxara bilməzdi.(١)

### ?... Bibi bunlar bizi müsəlman bilmirlərmi

Həzrət Rüqəyyənin (ə) qüslü tamam olduqdan sonra, onu əsirlikdə köhnəlmiş elə həmin öz köynəyi ilə kəfən edib, qürbət diyarda, Şamın xarabasının bir küncündə dəfn etdilər.

Həzrət Rüqəyyə (ə) dəfn olunan gecəsi, həzrət Ümmü Gülsüm heç cür aram olmurdu. O, dayanmadan ağlayır, nalə və fəryad edir, xarabanın ətrafında gəzirdi. Əhli beytin (ə) xanımları nə qədər təsəlli versələr də o, sakitləşmirdi. Ondan bunun səbəbini soruşanda dedi: Keçən gecə Rüqəyyənin (ə) mənim qucağımda yuxuya



---

١- [١۴٩] ٢٠٠ dastan əz kəramat və məsayib həzrət Rüqəyyə.

getməsi yadıma düşür. Gecə yarısı yuxudan ayılıb gördüm o, bərk ağlayır və sakit ?olmur. Ondan soruşdum: Niyə ağlayırsan

Rüqəyyə (ə) mənə dedi: Bibican, bu şəhərdə mənim kimi əsir olmuş və ev-eşiyindən uzaq düşən var? Bunlar bizi müsəlman bilmirlərmi ki, çörək və suyu bizdən (əsirgəyirlər, biz yetimlərə yemək vermirlər?(١

**...Bəs bizə demişdilər Yezid ğəssalə və kəfən göndərib**

Ayətullah İsna Əşəri buyurdu: Hacı Həsən Ağa Şirazidən eşitdim ki, mərhum Ayətullah :Seyid Möhsindən nəql edirdi

Ayətullah Seyid Möhsin Cəbəl Amilinin zamanında az qalmışdı ki, həzrət Rüqəyyənin .((ə) pak qəbrini su tutsun. (o yaxınlıqda bir çay var idi

.Dedilər ki, biz çayı döndərə bilmərik, bədəni buradan başqa bir yerə aparın

.Ayətullah Seyid Möhsinə dedilər ki, bu işi sən et

Seyid Möhsin dedi: Əgər, çayı döndərmək mümkün olmasa, biz bu işi edərik. Qəbri .açarıq və bədəni çıxararıq

Seyid Möhsin, qəbri açmağa hazırlaşdı. O qüsl edib, ağ libas geyindi və qəbri açmaq .əmrini verdi

Qəbrin üstünün torpağını götürdülər. Ləhədin kərpicinə çatdıqda, Seyid Möhsin dedi: .Səbr edin, ləhədi öz əlimlə açım

Seyid Möhsin qəbrin içinə girdi. Həzrət Rüqəyyənin (ə) başı üzərindəki kərpicləri götürən kimi o, huşdan getdi. Camaat seyidin yerə yıxılmağını görəndə, onu :qucaqlarına aldılar. Seyid huşa gəldi və dayanmadan, ardıcıl deyirdi



---

.Misbahul-hərəmeyn[١٥٠] -١

Ey vay mənə! Ey vay mənə! Bizə demişdilər ki, Yezid, ğəssalə qadın və kəfən göndərib, amma indicə başa düşdüm ki, yalan imiş, çünki bu balaca qızı elə həmin öz köynəyi ilə dəfn ediblər. Onun bədəni ətir saçan bir gül kimidir. Mən onun bədəninin yerini dəyişdirə bilmərəm. Çünki, qorxuram bundan sonra bir daha "Rüqəyyə binti Hüseyn (ə)" ünvanı ilə tanınmasın.və mən onun cavabını verə bilmərəm. Çayı döndərmək üçün (nə qədər xərc lazım olsa mən verirəm, çayı döndərin.(١)

### Qəm karvanı Rüqəyyəsiz (ə) imam Hüseynin (ə) qəbri kənarında

Əhli beyt (ə) Şamdan Mədinəyə qayıdır. Qafilənin saribanı Bəşir, Peyğəmbərin (s) əhli beytini izzət və ehtiramla aparır. Hər yerdə istəsələr, istirahət üçün dayanırlar. Burada həzrət Rüqəyyə (ə), atasının nazdanəsi, üç yaşında çoxlu müsibətlər çəkən, nəvaziş əvəzinə taziyanə görən, o başı bəlalı qız yada düşür. Elə bil, bütün çətinliklər onun zamanında imiş. Axı Rüqəyyə (ə) üryan naqələr üstə çox yorulmuşdu, hətta canı ağzına gəlmişdi. Qəmçi vuranların qorxusundan səsini çıxara bilmirdi. Axır dözməyib, bacısı Səkinəyə (ə) dedi: Bacı saribana de: qafiləni saxlasın, bir az istirahət edək. Dəvə .üstündə daha ürəyim qurtardı

.Amma Yezidin dinsiz-imansız mə'murlarından qəmçidən başqa bir cavab görmədi

Bəşir qafiləni gətirib, Mədinə və Kərbəlayə gedən yol ayrıcına çatdırdı. Əhli beyt (ə) Bəşirə, əvvəl onları Kərbəlayə aparmalarını əmr etdilər. (Ya Hüseyn zəvvarın gəlir, amma nazlı qızın Rüqəyyə...) Bəşir onları Kərbəlayə



---

.Səhabu-rəhmət, səh. ۷۷۲[۱۵۱]-۱

gətirdi. Qafilənin Kərbəlaya çatması ilə nalə və şivən ucaldı. Hamı vay imamım, vay Hüseynim deyə fəryad edirdi. O qədər ağlayıb, şivən etdilər, başlarına torpaq tökdülər ki, o yaxınlıqda yaşayan camaat, onların ətrafına yığışdılar və ağlamağa məşğul oldular. Hər biri özünü əzizinin qəbri üstə atıb ağlayır, başına torpaq tökür, dərdini deyirdi. Həzrət Zeynəb (ə) növhə oxuyur, qalanları ağlayır, əgər o yorulsa, həzrət Ümmü Gülsüm növhəni davam etdirirdi.(١)

Həzrət Zeynəb (ə) yanıqlı nöhə oxuyurdu, birdən qardaşına bir söz dedi ki, hamıdan ah qopdu. O, qardaşının qəbrinə üz çevirib, ərz etdi: Hüseyncan! Daha Rüqəyyəni soruşma. Çünki ondan danışmağa taqətim yoxdur. Hüseyncan, balalarının hamısını gətirmişəm, amma təkcə, şirin dilli qızın, Rüqəyyəni soruşma. Hüseyncan, nazdanənin ölümünü sənə necə xəbər verim? Onu Şam şəhərinin xarabasında, Əli (ə) və Əli övladlarının düşmənlərinin arasında tənha qoydum.(٢)

### Mədinədə həzrət Rüqəyyəyə (ə) əza məclisi

Əhli beyt (ə) əsirləri Şamdan Mədinəyə qayıdan kimi əzadarlığa məşğul oldular və gecə-gündüz matəmə qərq olub, göz yaşı tökür, nalə edirdilər. Onlar ləziz yeməklər yemədilər və sərin su içmədilər. Yeddi il onların mətbəxində xörək bişmədi. Zəiflikdən gözlərinin yaşı qurumuşdu. O qədər xörək yemədilər ki, həzrət imam Zeynul-Abidin (ə) özü onların otaqlarına gedir, onlardan yemək yeməlerini, su içmələrini istəyirdi. Amma o həzrət özü, hər vaxt su görsəydi, ya qarşısına xörək qoysaydılar,



---

١- [١٥٢] Müntəxəbut-təvarix.

٢- [١٥٣] Həzrət Rüqəyyə (ə), Şeyx Əli Fəlsəfi.

.o qədər ağlayardı ki, mübarək gözünün yaşı o su və ya xörəyə qarışardı

Seyid ibn Tavus, imam Sadiqdən (ə) nəql edir ki, buyurdu: İmam Səccad (ə) atasının müsibətinə qırx il ağladı. O gündüzləri oruc tutur, gecələri isə ibadətlə başa vururdu. Hər vaxt iftar olduqda, xidmətçi onun xörək və suyunu gətirib yanına qoyur və ərz .edirdi: Ey mənim ağam, buyurun xörək meyl edin

:İmam buyururdu

قتل ابن رسول الله جائعا قتل ابن رسول الله عطشانا

Allah Peyğəmbərinin (s) oğlunu ac öldürdülər, Allah Peyğəmbərinin (s) oğlunu susuz .öldürdülər

O həzrət ardıcıl bu sözü təkrar edir, o qədər ağlayırdı ki, gözünün yaşı xörək və suyuna (qarışırdı. O həzrətin halı Allah dərgahına qovuşana qədər belə oldu.(١

Bəli, əsirlər Mədinəyə qayıtdıqdan sonra neçə gün əza məclisləri quruldu. Əhli beytin .(ə) nə gecələr və nə gündüzlər sakitliyi və aramlığı olmadı

Mədinə camaatı hər gün dəstə-dəstə onların yanına gəlir və başsağlığı verirdilər. Həzrət Zeynəb (ə), Mədinə qadınlarına Kərbəla, Kufə və Şamın hadisə və .müsibətlərindən danışır, onlar da ağlayırdılar

Həzrət Zeynəb (ə), Şamda çəkdikləri müsibətlərdən danışarkən xaraba və həzrət Rüqəyyə (ə) yadına düşdü və buyurdu: Amma Şamın xarabasında Rüqəyyənin .şəhadəti belimi bükdü və saçımı ağartdı

Qadınlar, həzrət Rüqəyyənin (ə) müsibətini eşidəndə nalə və şivən səsləri ucaldı, belə (ki, daş ürəkləri yumşaldırdı.(٢



---

.Lühuf, Seyyid ibni Tavus [١۵۴]-١

.Nasixut-təvarix, səh.۵٠٧ [١۵۵]-٢

### Həzrət Rüqəyyəyə (ə) kəfən gətirmişəm

:Əhli beyt (ə) məddahı Hacı Əsədullah Süleymani nəql edir

Tehranlı məddah Həsən Zülfüqaridən və əhli beyt (ə) şairi Hacı Qulam Riza Sazigardan nəql olubdur ki, dedi: Bir nəfərdən eşitdim ki, deyirdi: Həzrət Rüqəyyəni (ə) ziyarət etmək üçün Şama getmişdim. Bir gün hərəmi-mütəhhərdə dayanıb, ziyarətnamə oxuyurdum. Bir qız uşağının hərəkəti məni özünə cəlb etdi. O, bir qədər ağ parçanı zərihin üstünə atmaq istəyirdi, amma bacarmırdı. Yaxınlaşıb dedim: Qız, nə etmək istəyirsən? Cavab verəndə gördüm, azəri dillidir və ata-anası ilə birlikdə gəlib. Dedim: ?Hamı həzrət Rüqəyyə (ə) üçün oyuncaq gətirir, sən nə üçün parça gətirmisən

Dedi: ata-anam (onları göstərdi) mənə dedilər ki, həzrət Rüqəyyənin (ə) kəfəni yoxdur. (Mən də ona kəfən gətirmişəm.(١

### Gəldim görüm, ayaqlarının yaraları sağalıb ya yox

Şamın “Zeynəbiyyə” elmi hövzəsinin tələbələrindən biri, höccətül-islam vəl-müslimin :Seyid Əsgər Heydəri nəql etdi

cı hicri şəmsi ilində namazdan sonra həzrət Rüqəyyənin (ə) səfalı zərihinin-١٣٥۶ .kənarında qəribə bir mənzərə gördüm

Təbriz əhlindən olan türk bir qoca kişi pak zərihə yapışıb, hey fəryad edir, ağlayırdı. .Camaat da bu mənzərəni görürdülər, ağlayırdılar. Bir qovğa yaranmışdı



---

.Sitareyi dirəxşani Şam, Şeyx Əli Rəbbani Xəlxali, səh. ٢٢٢ [١٥۶] -١

Qoca kişi imam Hüseynin (ə) qızı ilə türk dilində danışır və göz yaşı tökürdü. Mən türkcə .bilmədiyim üçün, türk dilini bilənlərin birindən onun nə dediyini soruşdum

Dedi: O, deyir: Rüqəyyəcan, çoxdandır ki, adımı qeyd etdirmişəm və Şama gəlməyi arzulayırdım. Mənim istəyim bu deyil ki, uşağıma şəfa verəsən, ya dünyəvi və maddi halım yaxşılaşsın, ya Qiyamətdə əlimi tutasan. Yox, yox, bunların heç biri üçün gəlməmişəm. Təkcə gəlmişəm ki, görəm halın necədir? Bədənin sağalıb, ya yox? Ayaqlarının yaraları sağalıb, ya yox? Ürəyin sağalıb? Gedək İrana, Təbrizə gedək, .orada qızıldan sənə həyət düzəldim. Öz canımı sənə qurban edim

.Bunları deyib ağlayırdı və təvəssül etmişdi

(Öz-özümə dedim: Kaş mən də bu əqidə və ixlasda olurdum.(١

### Həzrət Rüqəyyə (ə) təvəllüddən şəhadətə qədər

Morği-təb'im(٢) pər(٣) açıbdır, feyzi-məna(۴) axtarır

Fil-misəl bir qətrədir ki, vəsli-dərya(۵) axtarır

Sineyi-Sinayi-dəftər, dəsti-bəyza(۶) axtarır

İstərəm Zəhrayi-sani(٧), qəmli ulduzdan yazam

Guşeyi-viranədə məzlum ölən qızdan yazam

(Gövhəri-dəryayi-ismət(٨), fəxri-Ali Turab(٩



---

.Sitareyi dirəxşani Şam, Şeyx Əli Rəbbani Xəlxali, səh. ٢٢٣ [١۵٧] -١
Ruhum [١۵٨] -٢
Qanad [١۵٩] -٣
Həqiqətə çatmaq [١۶٠] -۴
Dəryaya qovuşmaq istəyən bir qətrə kimidir[١۶١] -۵
Nurlanmış əl [١۶٢] -۶

(Bəndi-qəlbi-padişahi-Kərbəla(۱), iffət niqab(۲

(Qönçeyi-bağı-fəzilət(۳), doxtəri-paki-Rübab(۴

(Valideyni ruzi-miladində ğərqi-iftixar(۵

.Gül üzündən öpdülər, adın Rüqəyyə qoydular

Verdi Zeynəb, bağıban ağuşinə ziba(۶) gülü

Al, dedi, qardaş qucaqə, öp bu xoş-sima gülü

.Oxşayır Zəhrayə eynən gülşəni-Zəhra gülü

(Həmd ola lütf eyləyib, Allah, bənati-Yasinə(۷

.Könlüvə Zəhra düşəndə bax gözəl simasinə

Xaliqi Rəhman sənə öz rəhmətindən pay verib

Aftab mülki-Bəthayə gözəl bir ay verib

.Boş görüb Zəhra yerin, Zəhraya Allah tay verib

Öp doyunca ləblərin, qəlbində həsrət qalmasın

Çox gözəl qızdır, Hüseyn, Allah əlindən almasın

Ver icazə bir neçə gün, mehman olsun mənə

Mənzilimdə baisi-təskini-can(۸) olsun mənə

(Razı olsan Yasəmən ülfət tapar Nilufərə(۹

.Söz verirəm qoymaram, qardaş qucaqimdən yerə

səh:۷۲

---

Kərbəla padişahının ürəyinin bəndi [۱۶۶] -۱

۲- Pak [۱۶۷]

۳- Fəzilət bağının qönçəsi [۱۶۸]

۴- Rübabın pak qızı [۱۶۹]

۵- Dünyaya gəldiyi gün iftixara qərq olmuş [۱۷۰]

۶- Gözəl [۱۷۱]

۷- Yasin (Mühəmməd s.) qızlarına [۱۷۲]

۸- Ürəyimin təskinliyinə səbəb [۱۷۳]

۹- Gül adıdır [۱۷۴]

(Etdi fərmayiş Hüseyn, ey xahəri-niku-məab(١

Razıyıq, Zeynəb bu istidayə(٢) həm mən, həm Rübab

.(Hər nə əmrin var gərək, olsun bu evdə müstəcab(٣

Şahidəm gərçi bu nozadim(۴) əzizindir sənin

.Min Rüqəyyəm olsa Zeynəbcan, kənizindir sənin

Tərbiyət kaşanəsin(۵) tədbir ilə abad elə

Zeynəbiyyəndə bu tiflin yaz adın, irşad(۶) elə

.Dərsi-eşqi-mərifət öyrət özün ustad elə

Xoşdu xəncərlər misalı məntiqi, bürra(٧) ola

.Hər cəhətdən könlüm istir, ayrı bir Zəhra ola

Bağiban ol, bağı-Zəhrada bu qəmli susənə

Pərvəriş ver gül kimi, versin təravət gülşənə

.Məndən artıq sən məhəbbət eylə, öyrənsin sənə

Fani dünyadı, vəfası ruzigarın(٨) yox bacı

.Bilmək olmaz, bəlkə ömrün məndən oldu çox bacı

Sinən üstündə yatırt, gəhvarəyə öyrəşməyə

Öyrədin bir ayrı rəngə, qarəyə öyrəşməyə

.Könlüm istir, Zeynəbim, guşvarəyə(٩) öyrəşməyə

Caməsin tez-tez dəyiş, gərd-o-ğübarə(١٠) batmasın

۱- [۱۷۵] Gözəl aşibətli bacı

۲- [۱۷۶] İstək

۳- [۱۷۷] Qəbul

۴- [۱۷۸] Təzə dünyaya gəlmiş, körpə

۵- [۱۷۹] Ocaq, yurd

۶- [۱۸۰] Hidayət et, tərbiyə et

۷- [۱۸۱] Kəsici, iti

۸- [۱۸۲] Dünya

۹- [۱۸۳] Sırğa

۱۰- [۱۸۴] Toz-torpaq

Gəlməyincə mən evə dindir, danışdır yatmasın.

Həzrətin fərmayişindən Zeynəb, oldu əşgi-bar(۱)

Ərzi qıldı, bu suzindən(۲) yandı qəlbim ey nigar

Taro-pud peykərim(۳) oldu Hüseyncan, şöləbar.

Bacı istər qardaşın çiynində getsin mədfənə(۴)

Səndən artıq ömrüm olsa, onda qardaş vay mənə.

Sən özün şahidsən ey bəzmi-sittin məhrəmi

Bir tükünlə versələr, Zeynəb dəyişməz aləmi

Mən səni görməkdən ötri keçmişəm mehriyyəmi.

Var ümidim qəlbimə tufani-hicran əsməsin

Sayövi Allah, Hüseyncan başim üstdən kəsməsin.

Bacı istər gözlərin can versə qardaş bağlaya

Layiq öz şə'ni şəhrində əzasın saxlaya

Könlüm istir qəbrimin üstə Rüqəyyən ağlaya

Mehribanlıq görsə məndən əmmə canım vay deyər

Qara məcər başda, şirin dil balam, lay-lay deyər.

Tərbiyət etdi qərəz Zeynəb, o əla gövhəri

Oldu eynən zahir və batində Zəhra məzhəri

Sürmədi eşqin olublar badə nuş sağəri(۵)

Gəzdilər qolbağlı bahəm pa-be-pa(۶) səhraları

(Guşeyi-viranə oldu aqibət məvaları(۷

səh:۷۴

---

Gözü yaşlı [۱۸۵] -۱

Dərdindən [۱۸۶] -۲

Paralanmış bədənim [۱۸۷] -۳

Qəbrə [۱۸۸] -۴

Taziyanə ilə döyüldülər [۱۸۹] -۵

Addım-addım [۱۹۰] -۶

Məkan [۱۹۱] -۷

(Guşeyi viranə yox, bəzmi-əzadarani-eşq(١

Məclisi-dildadəgan(٢) həzrət-Sültani-eşq

Bir tərəfdə ağlaşırlar dəsteyi-tiflani-eşq

Bir tərəfdə bir xanım boş qundaqə lay-lay deyir

.Bir ucaboy, qarəpuş örət(٣), Hüseynim vay deyir

Ravi nəql eylir: üsəranın Hüseynim vay səsi

Bir gecə bədxab edib(۴), guya Yəzidi nakəsi

.Yatmağa imkan dedi: vermir əsirlər naləsi

Görməsə qoymaz məni asudə Zeynəb, qardaşın

Yollayın viranəyə dilbəndi Zəhranın başın

Səs düşübdü yol verin, dürdaneyi Zəhra gəlir

Teşti-zərdə(۵) rə'si-şahənşahi-aşura(۶) gəlir

.Gəl Rüqəyyə hardasan? didaruvə(٧) baba gəlir

(Gül yox idi, rahi şahənşahidə pərvər ola(٨

Başlarından yoldu qızlar, saçların tökdü yola

Dəsteyi-nisvan(٩) aşura qurubdur əncümən

Etdilər viranəni Yəsrib kimi beytul-hüzn

Açdılar sərpuşini(١٠) gün çıxdı güya teştidən



---

١- Eşq əzadarlarının məclisi [١٩٢]

۲- [۱۹۳] Aşiqlər məclisi

۳- [۱۹۴] Qara geyinmiş qadın

۴- [۱۹۵] Yuxudan oyadıb

۵- [۱۹۶] Qızıl teştdə

۶- [۱۹۷] Aşura şahənşahının başı

۷- [۱۹۸] Görüşünə

۸- [۱۹۹] Şahənşahın yollarına səpilə

۹- [۲۰۰] Qadınlar dəstəsi

۱۰- [۲۰۱] Örtüyünü

(Etdilər mehmanə hörmət qəmli sahibxanələr(۱

.Şəm’i görcək başladı pər(۲) vurmağa pərvanələr

(Hakim idi çün ədəb, nisvani-beytul-əhzənə(۳

Əvvəlin növbətdə Zeynəb, başlayıbdı şivənə

Qəmli zairdən(۴) dedi: əvvəl salam olsun sənə

Ağ geyər hacı gedəndə Məkkəyə ey möhtəşəm

Kə’bədən başsan mənə əfv elə qarə geymişəm

Sərfəraz(۵) olsun adun, olduq Hüseyncan sərfəraz

Almışam ey ruhi-əqdəs(۶), göz yaşimdən dəstəmaz

.Üz-bə-üz dur, Kə’bəyə istir bacın qılsın namaz

Gözlərin məş’ər, ləbin zəmzəm, üzün beytul-hərəm

Baxdıqca Kə’beyi-Zəhrayə vəllah doymaram

Heyf ola indi bu qürbətdə qəribi bikəsəm

(Bir əli boş mizbanəm(۷), bəxtimə dilva pəsəm(۸

Kaş olurdu əldə imkanım, sənə qurban kəsəm

(Vardı həqqim göz yaşımdan olsa dərya damənim(۹

Parça-parça ləblərin ovraqi-eşqimdir(۱۰) mənim

Zeynəbin bəli! Vəfası oxşayır əfsanəyə



---

Ev sahibləri [۲۰۲] -۱

۲- [۲۰۳] Qanad

۳- [۲۰۴] Qadınların hüznlü evinə

۴- [۲۰۵] Ziyarətçi

۵- [۲۰۶] Uca

۶- [۲۰۷] Ruhu çox pak

۷- [۲۰۸] Ev sahibi

۸- [۲۰۹] Nigəran

۹- [۲۱۰] Ətəyim

۱۰- [۲۱۱] Eşqimin vərəqləri

Aşiqanə sözləri təsir edər biganəyə

Əlqərəz növbət yetişdi bülbülü-viranəyə

Tellərin rədd eylədi əvvəl üzündən, ax, dedi

Fatimə oxşarına, Zəhrayə xatir bax! dedi

Xoş gəlmisən bu məhqər(١) mənzilə, ey məhliqa

Layiqi şə'nin deyil bu səqfsiz viransəra

?Bu nə küldür gözlərin üstündə, hardaydın baba

Səslədim Şamın yolunda vermədin sən hay mənə

.Bari ver bir busə qanlı ləblərindən pay mənə

Könlüm istir bu gecə hicranimə payan(٢) verəm

Canımı xoşdur ki, öz cananıma qurban verəm

.Vardı peymanım(٣), öpəm gül ləblərindən can verəm

Fikrin olsa getməyə ayrı diyarə ay baba

Səbr elə qoysun məni əmməm məzarə, ay baba

(Olmasaydı ləblərində yarə ey ziba-nigar(۴

Buseyi-məstanivə(۵) indi çəkərdim intizar

.Neyləyim, çarəm nədir, gül ləblərində yarə var

Arzu eylər öpə çün, dəm-bə-dəm ulduz ayı

(Əzbəs(۶) öpdüm surətindən, busəmin yoxdur sayı(٧

**İntiqam**

Əmir Qütbəddin Teymur Qurqani böyük məmləkət sahibi idi və müxtəlif ölkələri öz hökumətliyi altına

səh:۷۷

---

۱- [۲۱۲] Sənə layiq olmayan

۲- [۲۱۳] Son

۳- [۲۱۴] Əhdim

۴- [۲۱۵] Gözəl üzlüm

۵- [۲۱۶]Dodaqlarına

۶- [۲۱۷] O qədər ki

۷- [۲۱۸] Hüseyn Ğəffari Ərdəbili

gətirmişdi, kafirlərə cizyə təyin etmişdi. O, ٨٠٣-cü qəməri ilində Şama gedir, Hələb ətrafında Şam əmirləri ilə döyüşür və onları məğlub edir. Əmir Teymur Dəməşqə gəlir və Şamın vilayətlərini qarət edir, o qədər qənimət ələ gəlir ki, yazmağa aciz qalırlar. Şam şəhəri alındıqdan sonra şamlıların əhli beytə (ə) zülm və sitəmlərindən əmir Teymura xəbər verirlər. Qeyrət atəşi onun sinəsində zəbanə çəkir. Şamın böyükləri hamısı ona müt'i olmuşdular. Teymura xəbər verdilər ki, Şam sultanının bir qızı var. Teymur o qıza elçilik etdi və Şam şəhərin bəzətdirib, çil-çıraq asdırdı. Bütün toy və şadlıq vasitələri hazır olduqdan sonra, sultanın qızını hamama apardılar. Əmir Teymur öz xidmətçisini çağırıb, hamamın qapısına üryan dəvə göndərməsini və sultanın qızını .o dəvəyə mindirib, çıpaq halda şəhərdə gəzdirmələrini ona əmr etdi

Şam camaatı bu əmrdən xəbərdar olduqda əlləri yaxalarında əmir Teymurun ?hüzuruna gəlib, ərz etdilər ki, bu nə zülmdür ki, bizə rəva görürsən

Əmir Teymur, həsrətlə onlara bir nəzər salıb buyurdu: Bu nə qovğa, fəğan və şivəndir. Mənim bir kəsə zülm etmək qəsdim yoxdur. Mən, elə güman etdim sizin qanun və adətiniz belədir ki, böyüklərin və ali şəxslərin qızını başı açıq bazarda gəzdirirsiniz?! ?Şamlılar dedilər: Hansı dinsiz, belə bir əməli, bir müsəlmanın namusuna rəva görər

Əmir Teymur, göz yaşı yağdırdı və dedi: Ey bihəya dinsizlər və zülmkar yezidpərəstlər! Hansı padşahın övladı Peyğəmbərin (s) övladından nəcibdir? Hansı böyük, həzrət Fatimeyi Zəhranın qızından əzizdir ki, siz onları üryan dəvələrə mindirib, bazarlarda gəzdirdiniz, Cəbrailin (ə) su verdiyi ağaclara (əhli beytə) zülm etdiniz, xeymələrini ?yandırdınız

Sonra dedi: Ey qeyrətsiz tayfa! Siz bununla belə ki, gördünüz Əhmədi Muxtarın (s) övladlarını haqsız olaraq şəhid etdilər və Peyğəmbərin (s) qızlarını bu diyara gətirdilər, şəhəri, bazarları bəzədiniz və Peyğəmbərin (s) itrətinə tamaşa etməyə gəldiniz. Əfsus! .Əfsus! Mən o gün dünyada olmamışam, ta o binamusların nəslini yer üzündən kəsəm

Ey şamlılar, and olsun Allaha, yaddan çıxartmaram, o zamanı ki, Peyğəmbərin (s) əhli beytinin hamısını bir kəndirə bağlayıb, rum və firəng əsirləri kimi haramzadə Yezidin yanına apardınız. Ey şamlılar, o gün Yezidin məclisində bir firəngli (fransalı) Peyğəmbər (s) övladlarının təəssübünü çəkdi. Allahın lə'nəti sizin ata-babalarınıza olsun ki, qeyrətiniz olmadı. Şamlılar onun sözlərindən başlarını aşağa saldılar və heç bir cavab .vermədilər

Sonra dedi: Ey şəxsiyyətsiz, mürtəd tayfa və ey Allahın və Peyğəmbərin (s) düşmənləri! Bir şamlı qızın əsirliyi sizə ağır gəlir, bəs Fatimənin (ə) qızlarını Şamda dolandırdınız, !?Peyğəmbərə (s) ağır gəlmədi

Əmir Teymur qoşununa əmr etdi ki, oradakı camaatı qılıncdan keçirsinlər və Şamı .viran etsinlər

(İndiki Şam şəhəri son zamanlar abad oldu.(١

### Həzrət Rüqəyyənin (ə) mütəhhər hərəmi

Həzrət Rüqəyyənin (ə) mütəhhər hərəminin yaxınlığında, təqvalı və zahid alim, mərhum Ələmul-Hüda Seyid Mürtəzanın nəvələrindən olan Seyid İbrahim Dəməşqi sakin idi. Onun ömrü doxsanı ötmüşdü. Dəməşq camaatı



---

.Dastanhayi tarix, ١-ci cild, səh.١٨٧[٢١٩] -١

.arasında xüsusi hörməti var idi. Seyidin üç qızı var idi və oğlu yox idi

Bir gecə onun böyük qızı, Əba Əbdillah Hüseynin (ə) qızı, həzrət Rüqəyyəni (ə) yuxuda görür ki, ona buyurur: Atana de, hakimə desin, mənim qəbrimlə ləhədin arasına su .nüfuz edib və bədənim əziyyətdədir, gəlsin mənim qəbrimi və ləhədi tə’mir etsin

Böyük qız yuxudan ayılab öz yuxusunu atasına danışır. Seyid İbrahim, sünnü və nasibilərin qorxusundan hakimin yanına getmir. İkinci gecə seyidin ortancıl qızı həmin yuxunu görür və atasına danışır. Seyid yenə yuxunun ardınca düşmür. Üçüncü gecə kiçik qız, həmin yuxunu görür və atasına danışır. Seyid bu dəfə də hakimin yanına gedib, macaranı demir. Dördüncü gecə seyid özü, həzrət Rüqəyyəni (ə) yuxuda görür ?ki, ona buyurur: Nə üçün hakimə xəbər vermədin

Seyid İbrahim sübh, Şam hakiminin yanına gedib, yuxusunu ona danışır və həzrət Rüqəyyənin (ə) mütəhhər hərəmini yenidən düzəltdirməsini xahiş edir. Hakim, şiə və sünnü böyüklərini çağırır və onlardan qüsl edib, təzə libas geyinib, sonra hərəmi mütəhhərə tərəf getmələrini istəyir və deyir ki, hərəmi mütəhhərin qapısı hər kimin əlində açılsa, qəbri açmaq, pak cəsədi çıxarmaq və qəbri yenidən tə’mir etmək şərəfi ona nəsib olacaq. Onlar hakimin göstərişinə uyğun olaraq növbə ilə qapıya tərəf gedirlər və qıfılı açmaq istəyirlər, amma qıfıl açılmır. Növbə Seyid İbrahimə çatır. O vüqarla qapıya tərəf gedir. Əlini qıfıla vuran kimi, qıfıl onu gözləyirmiş kimi açılır. Onlar hərəmə daxil oldular. Qəbri açmaq üçün hər biri növbə ilə gülüng vurular, amma Seyid İbrahimdən başqa heç kimin əlində işləmir. Mütəal Allah öz qüdrətini göstərir və (Hüseynin (ə

.nazdanəsinin vasitəsi ilə əhli beytin (ə) məzlumiyyətini və izzətini göstərir

Naməhrəmləri, bəli, naməhrəmləri mütəhhər hərəmdən çıxarırlar. Seyid özü tək, pak qəbri açır və ləhədi sındırır. Hüseynin (ə) nazdanəsinin kəfən və nazənin bədənini .salamat halda müşahidə edir. Göz yaşları ona aman vermir

Seyid, göz yaşı tökən halda o nazdanənin düşmən taziyanəsi ilə döyülməkdən göyərmiş bədənini qucağına alır və ləhəd yenidən tə’mir olunana qədər, yəni üç gün dizləri üstə saxlayır. Namaz vaxtı olarkən seyid o nazənin bədəni pak bir şeyin üstə .qoyub, namazını qılar

Seyid deyir: Həzrət Rüqəyyənin (ə) kəramətindən bu üç günün ərzində yeməyə, suya və dəstəmazımı təzələməyə ehtiyacım olmadı. Qəbir tamamilə düzəldikdən sonra, o pak bədəni ləhədə qoydum və qəbrin üstünü torpaqla örtdüm. Pak bədəni ləhədə qoyarkən, oğlum olmadığı üçün həzrət Rüqəyyəni (ə) vasitə qərar verdim. Allah mənə .bir oğul əta etdi və adını Mustafa qoydum

Axırda hakim macaranı sultan Əbdul Həmid Osmaniyə yazdı və o da həzrət Zeynəbin (ə), həzrət Rüqəyyənin (ə), həzrət Səkinənin (ə) və həzrət Ümmü Gülsümün (ə) (müqəddəs hərəmlərinin idarəçiliyini mənə tapşırdı.(١

### Həzrət Rüqəyyənin (ə) kəramətləri

Fələc qızın şəfası

Bir nəfər deyir: Xəstə bir qızım var idi. Xəstəliyi o qədər ağırlaşdı ki, onu zəiflətdi və axırda fələc oldu. Həkimlərə nə qədər müraciət etsək də, bir nəticə almadıq və onun



---

Bu kəramət, Hacı Mirza Haşim Xoraninin, Müntəxəbut-təvarix və başqa [ ٢٢٠ ] -١ .mötəbər kitablarda gəlibdir

müalicəsindən aciz qaldıq. Hər yerdən ümidim kəsildi. Özümün və xəstə qızımın halını fikirləşirdim ki, nə edim? Hara gedim? Birdən zehnimdə bir ümid işıqlandı. Özümdə ümidvar oldum ki, çarə var. Tibb evlərinin qapısına getsək (bizim üzümüzə) bağlıdır. Amma bir tibb evinin qapısı həmişə xəstələrin üzünə açıqdır və heç bir xəstə o tibb evindən naümid geri qayıtmır. Ürəyim Əba Əbdillahın (ə) nazdanəsinin hərəminə pərvaz etdi. Dedim, düzdür ki, yaşdan kiçikdir, amma o balaca əlləri ilə böyük düyünlər açır. Düzdür ki, balacadır, amma Mütəal Allahın yanında çox əzəmətli məqamı var, əlləri cəddi Yədullah Əlinin (ə) əlində olduğu üçün müşgülləri həll edir. Dedim, qızımın şəfasını ondan istəyim. Bu qəsd ilə hərəmə tərəf hərəkət etdim. Hərəmə daxil oldum. Gözüm onun hərəminə düşən kimi, göz yaşı mənə aman vermədi, ürəyim sındı, dərdi-dil etməyə başladım, dedim: Xanım, doktorlar məni geri qaytarıblar, amma sən məni .naümid geri qaytarma, uzaq yoldan gəlmişəm

Qızımı zərihin kənarına gətirdim. Gecə dəxil ünvanı ilə kəndirin bir tərəfini qızıma və o biri tərəfirni zərihə bağladım. Qızıma tapşırdım ki, bu qız, imam Hüseynin (ə) qızıdır və atası onu çox sevirdi. Ondan istə ki, sənə şəfa versin. Ağla, yalvar, dərdini de. Mən də bir tərəfə gedib, dua, ziyarət, namaz və təvəssülə məşğul oldum, öz halıma qərq oldum. Dünyadan ayrılıb, Həqq Təalanın Zatına müttəsil oldum. O halda qızımın şəfasını istədim. Bir müddətdən sonra özümə gəlib gördüm, gecədən xeyli keçib, hərəm sakitlikdir və heç kim yoxdur. Səhər, ya səhərə yaxın idi. Qızımı yaddan çıxarmışdım. Bir səs məni özümə gətirdi. Yaxşı qulaq asdıqda qızımın səsi olduğunu bildim. Ona tərəf getdim, gördüm ağlayır. Məni görən kimi dedi: Ata mən sağalmışam, ata mən sağalmışam. Onu

qucağıma aldım, soruşdum, qızım nə oldu? Niyə ağlayırsan? Dedi: Ata çox ağladım, axırda məni yuxu apardı. Yuxuda gördüm ki, zərihdən üç yaşlı bir qız çıxıb, mənə tərəf gəldi. Mənə yaxınlaşıb, dedi: Nə istəyirsən? Qalx! Dedim xanım, mən xəstəyəm, yerimdən tərpənə bilmirəm. Yanımda oturdu və o kiçik əlləri ilə bədənimə əl çəkdi. O vaxt mənə dedi: Sağaldın! Dur, atanın yanına get. Yuxudan ayılıb, heç bir narahatlıq hiss etmədim, amma ata, nə üçün o üç yaşlı qızın çöhrəsi qaralmışdı? Dedim, qızım o düşmənlərin ona vurduqları sili zərbələrinin yeridir.(۱)

### Anam və bibimlə gəlmişəm

Əhli beyt (ə) dostlarından olan bir qadın həmişə, harada Əba Əbdillah Hüseynin (ə) adına məclis olsaydı, o məclisdə iştirak edirdi və o həzrətin müsibətində göz yaşı tökürdü. O qadının əri sünnü məzhəbli idi. Bir gün arvadına dedi ki, səhər qonağımız olacaq, yemək hazırla və evi qonaqlar üçün hazırla.

O günün səhəri qonşu qadınlarından biri gəlib, o qadına filan məhəllədə əza məclisi olduğunu dedi. O qadın bu xəbəri eşidən kimi, evi təmizləyib, əza məclisinə getdi və özlüyündə dedi ki, qalan işləri qayıtdıqdan sonra edərəm.

Məclis uzun çəkdi və o qadın, o qədər ağlamışdı ki, huşdan getdi və özünə gəldikdə artıq xeyli gec idi. Öz-özünə dedi: çox gecikmişəm, ərim məni incidəcək, indi mən nə edim?

O qadın deyir: Tələsik özümü evə çatdırdım ki, bəlkə yemək hazırlaya biləm. Evə çatdım, qapını açıb gördüm, bir balaca qız, evi süpürməyə məşğuldur. Gəlib onun



---

۱- [۲۲۱] Əşgi bər se salə, Mühəmməd Hairi Təbar, səh.۳۶.

yanında dayanıb, dedim: Haradan gəlmisən? Burada nə edirsən? Olduqca şirin və dilrüba ləhcə ilə cavab verdi: Mən bibimlə birlikdə gəlmişəm və o, indi mətbəxdə .yemək hazırlayır

Qadın deyir: Mətbəxə gəldim, çox nurani və əzəmətli bir xanımın yemək bişirməyə məşğul olduğunu gördüm. İrəli gedib soruşdum: Xanım, olar ki, buyurasınız siz kimsiniz? Burada nə edirsiniz? Cavab verdi: Mən anamla gəlmişəm ki, yemək .hazırlayaq. İndi anam otaqdadır

Tez otağa keçdim. Onun nurunu görəndə, ixtiyarsız özümü onun qədəmlərinə atdım və yalvarıb, ondan xahiş etdim ki, xanım siz kimsiniz? Səndən başqa o iki xanım kimdir? Canım sizə qurban olsun, özünüzü mənə tanıtdırın. Xanım cavab verdi: Mən Hüseynin (ə) anasıyam və mətbəxdəki banu, Hüseynin (ə) bacısı, həyətdə gördüyün qız isə Hüseynin (ə) qızıdır. Mən o kəsin anasıyam ki, getdin ona ağlayasan. Mən də (onun əvəzində gəldim ki, sənə əziyyət olmasın və sənin işlərinə kömək edək.(١)

### De, adını Hüseyn qoysun

Həzrət Rüqəyyənin (ə) mütəhhər həriminə daxil olduqda, bir dəstə adamın, müqəddəs zərihin qarşısında ziyarətnamə oxumağa və əzadarlığa məşğul olduqlarını :gördüm. İxlaslı məddah, Hacı Nikuyi rövzə oxuyurdu. O, deyirdi

Həzrət Rüqəyyənin (ə) hərəmini genişləndirmək üçün ətrafdakı, evləri alırdılar. Yer sahiblərindən biri yəhudi, ya xristian idi. Evini hərəmin genişlənməsi üçün satmaq istəmirdi. Alıcılar hətta ٢,۵ dəfə yuxarı qiymətə almağa



---

.Bax: kitabi qədimi, Tənqihul məqal fi məqtəli xamisi al [٢٢٢] -١

razı idilər, amma o satmaq fikrində deyildi. Bir müddətdən sonra, onun arvadı hamilə olur və doğuş vaxtı yaxınlaşarkən həkimə aparırlar. Müayinədən sonra həkim deyir: Ana və uşaq, hər ikisi təhlükədədirlər və həkim nəzarəti altında olmaları lazımdır. Onlar .qəbul edirlər

Ev sahibi deyir: Elə ki doğuş ağrıları başladı, həyat yoldaşımı xəstəxanaya apardım və özüm qayıdıb, həzrət Rüqəyyənin (ə) hərəminin qapısına gəldim. Ona təvəssül edib, dedim: Arvadıma və övladıma nicat versən, onların şəfasını Allahdan istəsən, evimi .sənə təqdim edərəm

Bir müddət təvəssülə məşğul oldum. Sonra xəstəxanaya getdim, həyat yoldaşımın çarpayıda oturduğunu və uşağın da onun qucağında sağ-salamat olduğunu gördüm. Həyat yoldaşım dedi: Hara getmişdin? Dedim: bir yerə getmişdim, işim var idi. Dedi: Yox, getdin imam Hüseynin (ə) qızına təvəssül etdin! Dedim, haradan bilirsən? O dedi: Mən doğuş halında ağrının şiddətindən bəzən, huşdan gedirdim. Bu vaxt, bir qız uşağı xəstəxananın otağına daxil oldu və mənə dedi: Narahat olma, biz sənin və uşağının salamatlığını, Allahdan istəmişik. Övladınız da oğlandır. Mənim salamımı ərinə çatdır və de, adını Hüseyn qoysun. Dedim siz kimsiniz? Dedi: Mən, imam Hüseynin (ə) qızı, .Rüqəyyəyəm

Rövzə qurtardıqdan sonra məddahdan (Hacı Nikuyi) soruşdum ki, bu əhvalatı kimdən nəql edirsən? Cavab verdi: Həzrət Rüqəyyənin (ə) hərəminin xadimindən nəql edirəm. O özü sünnüdür və imam Hüseynin (ə) nazdanəsinin hərəmində xidmət etməyi ilə iftixar edir. Onun atası da həzrət Rüqəyyənin (ə) hərəminin xadimlərindən olubdur.(١)

səh:٨٥

---

.Sitareyi dirəxşani Şam, Şeyx Əli Rəbbani Xəlxali, səh. ٢٨١ [٢٢٣] -١

## (Bu üç yaşlı qızım Rüqəyyədir (ə

Təqvalı və ixlaslı vaiz, Hacı Seyid Əbdullah Təqəvi deyir: Mən neçə ildir ki, Tehranda məclislərə, yığıncaqlara və mənzillərdə minbərə gedirəm, məzlum cəddim, imam Hüseynin (ə) nökəri olmağımla fəxr edirəm. Gecələrin birində minbər qurtardıqdan sonra evə qayıtdım. Telefonun zəngi səsləndi, götürdüm gördüm, dostlarımdan biridir. Mənə dedi: Filan tacir dunyasını dəyişib və sabah filan məsciddə onun fatihə məclisidir. Mən, minbərə getmək üçün, onun varislərinə səni nişan vermişəm, saat üçdə (ya .dörddə) orada ol və minbərə getməyə hazırlaş

O vaxt yadıma düşdü ki, keçən gün, hər ay gedib rövzə oxuduğum mənzildə, bir xanım, səhər günortadan sonra, bu evin qarşısındakı evə gəlib rövzə oxumağımı məndən xahiş etdi. Dedi ki, mənim hacətim var və nəzr etmişəm ki, həzrət Rüqəyyə xatunun (ə) adına süfrə açam və siz gərək o balaca xanıma, imam Hüseynin (ə) əzizinə təvəssül rövzəsi oxuyasınız. Mən də ona tə'yin olunmuş saatda orada olacağıma söz verdim. Xülasə, telefonda dostuma dedim ki, mən sabaha qabaqcadan söz vermişəm ki, bir mənzildə həzrət Rüqəyyə xatun (ə) rövzəsi oxuyam. Dostum dedi: Ey ağa, mən !?istəyirdim sizə bir xidmət edəm, siz nə fikirləşirsiniz

Öz-özümə fikirləşdim ki, mən gərək neçə belə məclis, həzrət Rüqəyyə (ə) və həzrət Əli Əsğər (ə) rövzəsi oxuyam ki, mənə otuz min pul verələr, amma bu dünyasını dəyişən, varlı bir tacirdir, heç olmasa yaxşı pul verərlər. Hər halda, o xanımın evinə gedib rövzə .oxumaq fikrindən döndüm. Gedib yatağıma girib yatdım

Yuxu aləmində gördüm, xiyabanda, dünən orada rövzə oxuduğum həmin küçənin başında, nurani bir seyid durub və üç yaşlı bir qızın da əlindən tutub. Bir-birimizlə

salamlaşdıq, mən ondan soruşdum: Adınız nədir və Tehranın harasında yaşayırsınız? Cavab verdi: Mən özümün əza məclislərimin hamısında hazır oluram və bu da üç yaşlı qızım, Rüqəyyədir. Siz, biz ailəni maddiyyat və dünyaya satmayın. Nə üçün o qadına, evində rövzə oxumağa söz vermisən və gözü yolda qoymusan? Nə üçün vəfat etmiş tacirin vərəsələri sənə bir az çox pul verəcəklərinə xatir və’dənə xilaf edirsən? Bərk .ağlamağa başladı və o qızla, mən və’də verdiyim qadının evinə tərəf getdi

Mən yuxudan ayıldım və dostuma zəng etdim. Saat iki radiələri, gecənin yarsını keçmişdi. Ağlayaraq ona dedim: O tacir üçün keçiriləcək sabahkı məclisdə məni .gözləməyin. Heç cür gələ bilməyəcəyəm

Səhər söz verdiyim saatda, o xanımın evinə getdim, həzrət Rüqəyyə xatunun (ə) müsibətindən rövzə oxudum və gördüyüm yuxunu da minbərdə danışdım. Həm özüm, həm də eşidənlər bərk ağladıq, hətta rövzə qurtardıqdan sonra da biz ağlayırdıq. Xoş bir ətir iyi evin fəzasını bürümüşdü. Mən indiyə qədər özümdə belə bir hal (görməmişdim.(١

### De, neçə cümlə qızımın (Rüqəyyə) müsibətindən oxusun

Mərhum mühəddis Hacı Şeyx Əbbas Quminin oğlu, Mirza Əli Mühəddiszadə Tehranın :məşhur vaizlərindən və xətiblərindən idi. O, deyir

Bir ilisi xəstəliyə, boğaz narahatlığına və səsimin tutulmasına düçar olmuşdum. İş o yerə çatdı ki, hətta minbərə getmək və söhbət etmək imkanına belə qadir



---

١- [٢٢۴] .Sitareyi dirəxşani Şam, Şeyx Əli Rəbbani Xəlxali, səh. ٧٧

olmadım. Aydındır ki, hər kəs belə bir vəziyyətdə gərək müalicə fikrində olsun. Mən də .mütəxəsis və təcrübəli bir həkimə müraciət etdim

Müayinədən sonra məlum oldu ki, mənim xəstəliyim o qədər ağırdır ki, səs tarlarından bə’zilər işədən düşüb və fələc olub. Həkim nüsxə yazmaqdan əlavə neçə ay minbərə getməməyimi və heç kimlə söhbət etməməyimi, bir şey istəməli olsam onu yazmaq vasitəsilə istəməyimi tapşırdı Bəlkə bu istirahət və dərmanlardan istifadə etməyin .vasitəsi ilə əldən getmiş sağlamlığı yenidən qaytarmaq mümkün oldu

Əlbəttə, belə bir xəstəliyin qarşısında səbr etmək və camaatla, hətta ailə-uşaqla danışmamaq çox çətindir. Çünki insanın ən çox danışıb-eşitməyə ehtiyacı vardır. Necə olar ki, neçə ay heç nə deyib-danışmayam və ardıcıl istirahətdə olam?! Nəticənin isə nə olacağı mə’lum deyil. Hamıya aydındır ki, belə bir qorxulu xəstəliyin qarşıya çıxması ilə xəstə hansı hala düşür və onun narahatlığı fövqül’adə qüdrəti adamın yadına salır. Bu bir pərişanlıq halıdır ki, insan ümidini bütün bəşəri çarələrdən kəsib, ilahi dərgaha yaxın olanların sorağına gedir ki, onların vasitəsi ilə Mütəal Allahın dərgahına hacətini .ərz edib, Allahın sonsuz lütf dəryasından bir bəhrə alsın

Mənim də həzrət imam Hüseynin (ə) inayətinə təvəssül etməkdən başqa çarəm yox idi. Bir gün zöhr və əsr namazlarından sonra mən təvəssül halı tapdım. Çox ağladım və müqəddəs vücuduna təvəssül etdiyim, həzrət Əba Əbdillah Hüseyni (ə) müxatəb qərar verib dedim: Ey Allah Peyğəmbərinin (s) oğlu, belə bir xəstəliyə səbr etmək taqətimi əldən alıb. Bundan əlavə mən minbər əhliyəm və camaat, mənim onlar üçün minbərə getməyimi gözləyirlər. Mən ömrümün əvvəlindən indiyə kimi

minbərə getmişəm və siz əhli beytin (ə) nökərlərindənəm. İndi nə olub ki, mən xəstəliyimə görə birdən-birə belə bir həssas məqamdan kənarlaşam. Mübarək Ramazan ayı da yaxınlaşıbdır, dəvətləri nə edim? Ağa inayət buyur, Allah mənə şəfa .versin

Bu təvəssüldən sonra məni yavaş-yavaş yuxu apardı. Yuxuda özümü böyük bir otaqda gördüm. Onun yarısı nurlu və işıqlı, yarısı isə qaranlıq idi. İşıqlı olan tərəfdə kainatın mövlası, həzrət imam Hüseyn (ə) oturmuşdu. Çox sevindim və ovqatım yaxşılaşdı. Oyaq olduğum halda tapdığım təvəssül halını yuxuda da tapdım. Hacətimi ərz etməyə başladım. Məxsusən israr edirdim ki, Ramazan ayı yaxınlaşıbdır və mən neçə məscidə dəvət olunmuşam. Amma bu işdən düşmüş həncərə ilə necə minbərə gedərəm və söhbət edərəm. Bir halda ki, həkim uşaqlarımla belə söhbət etməyi .qadağan edibdir

Çox nalə edib, ağladığım üçün, həzrət mənə işarə edib buyurdu: Qapının ağzında oturmuş seyidə de, neçə cümlə qızımın (Rüqəyyə) müsibətindən oxusun və siz də bir az ağlayın, inşaallah yaxşı olar. Mən otağın qapısına tərəf baxdıqda, bacımın həyat yoldaşı, Hacı Ağa Mustafa Təbatəbai Quminin (ki, Tehranın alim, xətib və imam camaatlarından idi) oturduğunu gördüm. Həzrətin əmrini ona çatdırdım. O, əvvəl müsibət oxumaqdan boyun qaçırmaq istədi. Şəhidlər sərvəri (ə) buyurdu: Qızımın rövzəsini oxu. O, həzrət Rüqəyyənin (ə) müsibətindən oxumağa başladı, mən də ağlayıb, göz yaşı tökdüm. Amma çox təəssüflər olsun ki, uşaqlarım məni yuxudan oyatdılar. Mən də narahatlıqla yuxudan ayıldım və feyzlə dolu elə bir məclisdən məhrum olduğum üçün çox təəssüf etdim. Amma belə bir ali mənzərəni yenidən .görmək imkanı yox idi

səh:۸۹

O gün, ya səhəri həmin mütəxəsis həkimə müraciət etdim. Xoşbəxtlikdən, müayinədən sonra mə’lum oldu ki, qabaqkı xəstəlik və narahatlıqdan heç bir əsər-əlamət qalmayıb. Həkim çox təəccübdə idi və məndən soruşdu ki, siz nə yemisiniz ki, belə tez nəticə almısınız?! Mən, öz yuxumu və təvəssülümü ona danışdım. Doktorun əlində qələm var idi və ayaq üstə idi, amma mənim təvəssül hekayəmi eşitdikdən sonra, ixtiyarsız olaraq qələmi əlindən düşdü və kainatın mövlası imam Hüseynin (ə) adının təsirindən, mə’nəvi bir hal ilə təbabət mizinin arxasında oturdu və qətrə-qətrə göz yaşı üzünə axırdı. Bir az ağladıqdan sonra dedi: Sizin bu xəstəliyinizin təvəssüldən, qeybi kömək və inayətdən başqa heç bir çarəsi yox idi.(۱)

### Məsihi qadın həzrət Rüqəyyəyə (ə) təvəssül edib, şəfa alır

Höccətül-islam vəl müslimin Hacı Şeyx Mühəmməd Məhdi Tac Ləngərudi yazır:

Məşhur vaiz və dəfələrlə həzrət Rüqəyyənin (ə) qəbrinin ziyarəti üçün Şama getmiş, dostlarımdan biri minbərdə deyirdi:

Həzrət Rüqəyyənin (ə) hərəmində bir fransalı qadının müqəddəs asitanəyə hədiyyə ünvanı ilə iki qiymətli xalı gətirdiyini gördüm. Camaat onun fransız və xristian olduğunu bildikləri üçün, bu işdən çox təəccüb edirdilər, öz-özlərinə deyirdilər ki, görəsən qeyri-müsəlmanın bura gəlib və qiymətli hədiyyələr gətirməsinə nə bais olub?! Camaatda o qədər maraq yarandı ki, onun bu işinin səbəbini soruşdular. O, cavabında dedi:



---

۱- [۲۲۵] Təvəssülat və rahi ümidvaran, səh.۱۷۳.

Bildiyiniz kimi mən müsəlman deyiləm. Fransadan mə'muriyyət ünvanı ilə bura (Suriyaya) gəlmişdim. Bu müqəddəs asitanəyə yaxın bir mənzildə, məskən etdim. Birinci gecə istirahət etmək istəyərkən ağlamaq səsi eşitdim. Bu səslər dayanmadığı üçün soruşdum: Bu ağlamaq səsi haradan gəlir? Dedilər: Bu ağlamaq səsləri bu yaxınlıqda dəfn olunmuş bir qızın qəbrinin kənarından gəlir. Mən elə bildim ki, o qız bu gün ölüb və bu gecə dəfn olunub, onun ata-anası, yaxınları növhə oxuyurlar. Amma mənə dedilər ki, onun ölümündən və dəfnindən min ildən çox keçir. Mənim təəccübüm bir az da artdı və öz-özümə dedim ki, camaatın yüz illərdən sonra onu belə bir məhəbbətlə sevmələrinin səbəbi nədir?! Sonra mə'lum oldu ki, bu qız, adi qızlardan fərqlidir. Bu, imam Hüseynin (ə) qızıdır. Onun atasını müxalifləri və düşmənləri öldürüblər, övladlarını Yezid hökumətinin paytaxtı olan bu şəhərə əsirliyə gətiriblər və bu qız da burada atasının ayrılığından canını tapşırıb və dəfn olunub. Bu macaradan sonra, bir gün buraya (hərəmə) gəldim. Camaat hər tərəfdən aşiqanə gəlir, nəzir edir .və hədiyyələr gətirir, təvəssül edirdilər. Onun məhəbbəti qəlbimdə möhkəm yer elədi

Bir müddətdən sonra məni doğmaq üçün xəstəxanaya, doğuş yerinə apardılar. Müayinədən sonra mənə dedilər ki, sizin övladınız qeyri-təbii dünyaya gəlir və biz .cərrahiyə əməli aparmağa məcburuq

Cərrahiyə əməlini eşidən kimi ölümlə üzləşdiyimi bildim. Allah nə edim, ilahi narahatam, çarə nədir? Fikirləşdim ki, təvəssüldən başqa çarəm yoxdur. Gərək ...təvəssül edəm

Çarəsiz qalıb, əlimi bu qıza tərəf uzatdım və dedim: İlahi, səni and verirəm bu qızın haqqına ki, əsirlikdə

döyüblər, taziyanə ilə vurublar və atasının haqqına ki, haqq imam və Sənin Peyğəmbərinin (s) nümayəndəsi olubdur, onu zülm yolu ilə öldürüblər, mənə bu həlakətin təhlükəsindən nicat ver. Onda bu qızı müxatəb qərar verib dedim: Əgər bu .həlakətdən nicat tapsam, iki qiymətli xalımı sənin asitanənə hədiyyə edərəm

Allah şahiddir ki, nəzr və təvəssül etdikdən sonra çox çəkmədi ki, həkimlərin gözlədiyinin əksinə olaraq, övladım təbii yolla dünyaya gəldi və mən ölümdən nicat tapdım. İndi öz əhdimə və nəzrimə əməl edib, xalıları o qızın müqüddəs asitanəsinə (təqdim edirəm.(١

### Məsihi qızın şəfası

Məsihi bir qadın, öz fələc qızını Livandan Suriyaya gətirir. Çünki Livan həkimləri ona .mənfi cavab vermişdilər

Qadın, xəstə qızı ilə həzrət Rüqəyyənin (ə) əzəmətli hərəminin yaxınlığında mənzil .tutur ki, oradan qızının müalicəsi üçün həkimə müraciət etsin

Aşura günü çatır və o, camaatın dəstə-dəstə həzrət Rüqəyyənin (ə) hərəmi olan .məkana tərəf gəldiklərini görür

Şam camaatından bunun səbəbini soruşur. Deyirlər, burada həzrət imam Hüseynin (ə) qızının hərəmi var. O da xəstə qızını evdə tənha qoyub, otağın qapısını bağlayır və həzrət Rüqəyyənin (ə) hərəminə gəlir. Orada həzrət Rüqəyyəyə (ə) təvəssül edir, o qədər ağlayır ki, qəşş edib huşdan gedir. O halda kimsə ona deyir, ayağa dur, get evə, qızın təkdir və Allah ona şəfa veribdir. Ayağa qalxıb, evə



---

.Təvəssülat və ya rahi ümidvaran, səh.١۶١ [٢٢۶] -١

tərəf hərəkət edir və gəlib evin qapısını döyür, qızının sağ-salamat olduğunu və .oyuncaqlarla oynadığını görür

Ana qızının vəziyyətini görür və onun halını soruşur. Qız ananın cavabında deyir: Sən getdikdən sonra Rüqəyyə adlı bir qız otağa daxil oldu və mənə dedi: Dur, birlikdə oynayaq. O qız mənə dedi: Ayağa dura bilmək üçün Bismillahir-rəhmanir-rəhim de. Sonra mənim əlimdən tutdu və mən durdum, tamam bədənimin sağ-salamat .olduğunu gördüm. O, mənimlə söhbət edirdi ki, sən qapını döydün. Dedi: Anan gəldi

(Məsihi ana imam Hüseynin (ə) qızından bu kəraməti gördükdə müsəlman oldu.(١)

**Kiçik beşik**

Qum elmi hövzəsinin ustadlarından olan, təqvalı alim, höccətül-islam vəl-müslimin, :Seyid Mürtəza Müctəhidi Sistani nəql edir

Müqəddəs Məşhəd şəhərinin sakini, imam Hüseynin (ə) hərəminin xidmətçisi, Hacı :Sadiq Müttəqi ١۴١٨ (h.q) məhərrəm ayında mənə belə nəql etdi

Qızımın izdivacından altı il keçməsinə baxmayaraq hələ də övlad sahibi olmamışdı. Bir neçə həkimə müraciət etdik, çoxlu nüsxələrə əməl etdik, heç bir faydası olmadı. ١۴١٧ ci ilin səfər ayında Şama getdim. Getməzdən qabaq (qızımın) anası bir kiçik beşik düzəltdi və mənə dedi: Onu həzrət Rüqəyyənin (ə) mütəhhər zərihinə bağla, ta o xanımın .lütfündən bəhrələnək və hacətimiz rəva olsun

Mən kiçik beşiyi özümlə Şama apardım. Şamda imam Hüseynin (ə) üç yaşlı qızı həzrət Rüqəyyənin (ə) ziyarətinə getdim və o xanımın əzəmətli və qəmli hərəminə daxil səh:٩٣

---

.Sitareyi dirəxşani Şam, səh.٢٧٠ [٢٢٧] -١

oldum. O məzlumənin hərəmi elədir ki, bütün ziyarət edənləri öz təsiri altına alır. Beşiyi .zərihin yanına aparıb, ümidlə onu həzrətin nurani zərihinə bağladım

Orada dayanıb mənim işlərimə nəzarət edən bir şəxs dedi: Sizin nə üçün belə işlərə etiqadınız var? Dedim: Mənim etiqadım həzrət Rüqəyyəyədir (ə), beşiyə yox. Bu beşiyi, o həzrətə öz əqidə və etiqadımı aşkar etmək üçün vasitə qərar vermişəm ki, bu yolla həzrət Rüqəyyənin (ə) diqqətini özümə cəlb edim. Hər kəs öz mə'rifəti qədərində iş .görür və mənim mə'rifətim bu qədərdir, daha o həzrətin əzəməti qədər yox

Şamda əhli beytin (ə) hərəmlərinin ziyarətindən sonra İrana qayıtdım. Bir müddət keçmişdi ki, anası dedi: Gərək qızımızı yoxlanışa aparaq, ta yəqinimiz olsun ki, həzrət ?Rüqəyyə (ə) bizim hacətimizi Allah dərgahından alıb, ya yox

Yoxlanışdan sonra cavab müsbət oldu. Mə'lum oldu ki, bir kiçik beşiklə, öz etiqad və ümidimizi o həzrətə göstərib, onun lütf nəzərini özümüzə tərəf cəlb etmişik. İndi (qızımın beşikdə bir uşağı var.(١

### Şerlər, növhələr, mərsiyyələr

#### Şam yolunda həzrət Rüqəyyənin (ə) həzrət Zeynəbə (ə) ürək sözləri

Buyur əmmə, Şimri sitəmgərə mən zarə silsilə(٢) vurmsın

Babamın ğəmi bəs olur mənə, daxi yarə bu dilə vurmasın

Nədi cürmim(٣) axər ey əmməcan məni Şümr, ya Sənan vurar

səh:٩۴

---

.Sitareyi dirəxşani Şam, səh.٢٧۶ [٢٢٨] -١

Zəncir [٢٢٩] -٢

Günahım [٢٣٠] -٣

Atasız qıza bu qəraridir üzə əlində fəğan vurar

Həm ölüb atam, həm Əkbərim ürəyimdə yoxdi təvan vurar

Edəndə nalə yətim uşaq düşər ərşə zəlzələ vurmasın

Degilən qabardır ayaqlarım bu yolu piyadə gedəmmirəm

Əli Əkbərin başın görürəm cidadə gedəmmirəm

Anam ağlır, Əkbərin oxşayır ğəm olur ziyadə gedəmmirəm

De bu qövma Əkbərimin başın anamın müqabilində vurmasın

Görürəm baba başın dayanammıram, edirəm fəğan

Necə gör saralmışam əmməcan, zibəs(١) incidir məni sariban

Gecə-gündüz ağlaram ahilən nə qədri bu cismidə vardı can

.Yetişincə bari əcəl başa, de bu sariban hələ vurmasın

O qədri bəla mənə üz verib dəxi əmmə, qalmadı məndə tab

Kim olub mənim kimi xuncigər(٢) kimə zülm olub belə bihesab

Ayağım qabardı sızıldar, kəsib əmmə qollarımı tənab

De bu Şimrə, rəhm eləsin dəxi yetib iş müşgülə vurmasın

Bu qədri cəfa, sitəmləri necə bir yətimə rəva görür

Baxır əmmə nizədə Əkbərim, mən edəndə ah-o-nəva görür

Kəsilibdi çarəmiz əmməcan, bu qədri cəfani Xüda görür

De bari bu Xuli kafirə, atama edim giley vurmasın

?(Ayağım qabardı qaçammıram bu nə silsilə, nə tənabidir(٣

Bilisən ki, rəhm yətimlərə hər millət içrə səvabidir

Gedib əldən izzət-o-şokətim ürəyim yanıbdı kəbabidir

Mən Əli Əkbərə aşiqəm, o salıb məni çölə vurmasın

Yetişincə Şamə yəqindir məni belə zülmlər öldürür

O qədri ki, Şimr, Sinan vurar üzümə bu sililər öldürür

Üzə sili başimə əmməcan vurulur bu qəmçilər öldürür

Gedib ixtiyar-o-təvan dəxi yetişincə mənzilə vurmasın

Bu sitəmlə yolda gər ölməsəm , ölərəm o Şamidə bil yəqin

Qayıdam Mədinəyə bir də mən gəlir xəyalimə çox çətin

Nəzərindən salıbdılar əmmə məni Əkbər ilə babam Hüseyn



---

۱- [۲۳۱] Çox

۲- [۲۳۲] Ciyəri qanla dolmuş

۳- [۲۳۳] Kəndir

Niyə bəs cidadə babam demir məni sariban belə vurmasın

Yetir axirə sözü «Nazima» dəxi vermə çox da kəlamə tul(١)

Bəs olur təmam günahüvə əgər olsa bircə sözün qəbul

Gətirəndə məhşərə eyləməz bu xanım Rüqəyyə səni məlul

Deyəcəkdi, Nazimin əmrini babasın de müşgülə vurmasın.(٢)

### Həzrət Rüqəyyə xatunun Şam yolunda əhvalatı

Bilməm nə həzzi var fələkin inqilabidən

Bir ləhzə çəkmir əl əməli nasəvabidən

Gül başı üstə xarə(٣) verir fələk, pərvəriş

Baxmır ki, bağiban su verib əşgi nabidən(۴)

Gərduni dun(۵) qəfəs qəyirib əndəlib(۶) üçün

Gülzari zar edibdi cəfayi ğürabidən(٧)

Pərvazə şəhbaz gələn vəqtidə ğeyzilən

Titrər zəif quşlar o dəm iztirabidən

Şirin qəvidi pəncəsi hər ləhzə qan içər

Şirə zəiflər baş əyillər o babidən

Rubah(٨) çün xəbisidi tə’mini var onun

Qovğa edər doyurmasalar nan-o-abidən(٩)

Ahu və leyk pakidi məzlum edib fələk

səh:٩۶

۱- [۲۳۴] Uzun

۲- [۲۳۵] Əhəd Behiştizad

۳- [۲۳۶] Tikan

۴- [۲۳۷] Xalis su

۵- [۲۳۸] Pis dövran

۶- [۲۳۹] Bülbül

۷- [۲۴۰] Qarğanın cəfasından

۸- [۲۴۱] Tülkü

۹- [۲۴۲] Çörək və sudan

(Hər səmtə getsə vəhşəti var şix-o-şabidən(١)

Kimdir ala zəiflərin intiqamını

(Bazuyi şum(٢) və pənceyi qəhr-o-itabidən(٣)

Ayrı xəyal eyləmə ğərqəm xəyalə mən

(Çərxi məzəmmət eylirəm iltihabidən(۴)

Hər iş görüb fələk belə billəm bica(۵) imiş

Amma varımdı şükuh(۶) bir əmri əcabidən

Aya, Yəzidi səltənətə bəslədi fələk

?Ya incidi sülaleyi Xətmi-Məabidən

Aya, yəzidiyan nə səbəbdən əziz idi

Axər fələk nə gördi bu Ali-Türabidən

Çərx, istədi ki, Zeynəbi isbati həqq üçün

(Bipərdə gəzdirib oyada xəlqi xabidən(٧)

Zeynəb də tökdü məh yüzünə qanlı saçların

Cəbrən(٨), bəli mühəccəbə çıxmaz hicabidən

Xəffaş(٩) cəhli qovmvğa taleedi(١٠) sübh tək

(Zülmətli şamə dəvət olub aftabidən(١١)

Minmiş sınıq gəcavələrə bəxti qarələr



---

١- [٢۴٣] Qocadan və cavandan

Pis əllərdən [۲۴۴] -۲

Qəzəbli əllərdən [۲۴۵] -۳

Nigərançılıqdan [۲۴۶] -۴

Yersiz [۲۴۷] -۵

Şikayət [۲۴۸] -۶

Yuxudan [۲۴۹] -۷

Məcbur olaraq [۲۵۰] -۸

Gecə quşu [۲۵۱] -۹

Falçı [۲۵۲] -۱۰

Günəşdən [۲۵۳] -۱۱

Gözlərdə əşginab ürəklərdə yarələr

Qollar tənabə bağlı, vəli başları açıq

Düşməndi izdihamilə dörd bir kənarələr

Bə’zisinin qulağı olub yarə, qan axır

Mə’lumdur ki, ğarət olub guşivarələr

Bə’zisi səslənir: bala gün batdı hardasan

Axı bu vaxtlar süd əmər şirxarələr

Bə’zi deyir ki, əmmə sıxır boynumu tənab

Qəmçi acısı canıma salmış şərarələr

Bə’zi deyir ki, baş açıqam əmmə fikr elə

Tapşır bir azca fasilə açsın səvarələr

Mehr, imamət itrətini baş açıq görür

Mah sipəri(١) dudeyi-ahilə(٢) qarələr

Gün görsənir cidadə qiyamətdi Zeynəbə

Məğrib gəzir o qəlbi sınan məhparələr

Şamın yolun nə qədri gedillər qurtarmır

(Dildən düşüb gəcavədə axmış sitarələr(٣

(Bir gəllə ahivani-hərimi-şəriəti(٤

Salmiş qabaqinə qovalur heçkarələr

Hərdəm biri düşür yerə ol xırda qızların

Səslir ki, əmmə getmə dayan, eylə çarələr

Hər mənzilə düşüllər minən vəqtə naqəyə

(Zeynəb o xırda qızları bir-bir şümarələr(۵

Bir gün sayanda istədiyi qız tapılmadı

Qan vurdu cam çeşminə qəlbində yarələr



---

Ayların və günlərin keçməsini [۲۵۴] -۱

Ah və zarın tüstüsü ilə[۲۵۵] -۲

Ulduzlar [۲۵۶] -۳

Şəriət hərəminin bir dəstə ceyranlarını [۲۵۷] -۴

Cayır [۲۵۸] -۵

Başdan ucatldı əllərini baxdı nizəyə

Andırdı miri qafiləni bu işarələr

Nagəh görüblər rə’s Hüseyn(١) durdu getmədi

Qanlı gözü üzarə dürri şahvar(٢) ələr

Gün seyridən dayandi kəsib iltifatini

Aciz qalıb görən o başın mö’cizatini

Gördilə gər tapılmasa nazlı Rüqəyyəsi

Şam əhlinin məhal edəcək mümkinatini

Mə’mur ediblə Zəcrilə, bir şəxsi digəri

Gəldikləri yolun gəzələr şeş cəhatini(٣)

Zəcr axtarır Rüqəyyəni, amma Rüqəyyə də

Gözlər qəza ilən qədərin hadisatini(٤)

Zülmət gecə o qorxulu üç yaşında qız

Görmür yanında əmmələri, ümməhatini(٥)

Başın salıb aşağa, baxammır sağa-sola

Cari edir üzarinə əşgin fəratini

Halın görəndə göydəki quşlar sızıldaşır

Təhsin edillə dildəki səbr, sübatini

Əhvalinə sudan gələn ahular ağlaşır

Guya düa edillə o tiflin nicatını

Səslir babasını eşidir öz səsin yenə

Vəhşətdən az qalır verə əldən həyatını

Nə əmməsi verir səsinə səs, nə qardaşı

Həllali-müşgül(۶) istir aça müşgülatını

səh:۹۹

---

Hüseynin başı [۲۵۹] -۱

Göz yaşı [۲۶۰] -۲

Altı tərəfini [۲۶۱] -۳

Hadisələrini [۲۶۲] -۴

Analarını [۲۶۳] -۵

Müşkülləri həll edən [۲۶۴] -۶

Ümidi hər nədən kəsilir üz tutur göyə

Vazeh deyir şikayətinin hər nükatini

Allah, hayanda qaldı keçən günlərim mənim

?(Mən bu çölün gəzim neçə kuh(١), neçə fəlatini(٢

Əzbəs ki, incidib hamını ağlamaq səsim

Məndən kəsibdi əmmələrim iltifatini

Sən kəsmə lütfünü məni hifz eylə, ey Xüda

(Tofiqinin fərahəm eylə mocibatini(٣

Qoyma məni bu çöldə edə vəhşilər həlak

Xar eylədi zəmanə bu tiflin vəfatini

Faş etdi bəs ki, dərdi dil dağidarını

Hey tökdi göz yaşin üzə ney tək sızıldadı

(Çərxin gətirdi rəhmə vəli kəc mədarini(٤

O əmməsin çağırdı, vəli fələk Zəcri yolladı

Yandırdı tazədən dil ümidvarını

Kim qorxsa tez səlam verər naşünasə(٥) də

(İstər ki, salim eyliyə qəhrin şərarini(٦

Qəblən tanırdı çün o şəriri, Rüqəyyə də

(Verdi salam görmiyə Zəcr inzicarini(٧

Səd heyf ilə ədəbli balanın salamına

Naəhl idi, müxatəbi aldı qərarini

Bu əl apardı başə, o əl taziyanəyə

səh:۱۰۰

---

۱- [۲۶۵] Dağ

۲- [۲۶۶] Səhrasını

۳- [۲۶۷] Səbəblərini

۴- [۲۶۸] Tərs dövrünü

۵- [۲۶۹] Tanış olmayana

۶- [۲۷۰] Şərlərini

۷- [۲۷۱] Əziyyətini

Nili edibdi peykərini, gül üzarini

Bir söz dedi ki, Şimrə desəydi edərdi rəhm

Şimrün alardı əldən o söz ixtiyarını

Səsləndi vurma çox məni zalım əsirinəm

Səyyadlar cəhanda çox istər şikarını

Mən qaçmadım görəndə səni, sən də rəhm eylə

Axı nəvaziş ilə tutarlar fərarini

Mə’mursan aparmağa, mən hazıram gedim

Çox mayiləm ki, bir də tapam ğəm qatarını

Öldürmə bağla qollarımı, sal qabaqinə

Çoxlar çəkir bu ğəmzadənin intizarını

Öldürmək istəsən ona da hazıram yenə

Amma bu çöldə atma, bu möhnət düçarını

Sal nəşimi at üstə apar, Zeynəb əmməmə

Qazsın yol üstə ta bu qəribin məzarını

:Ravi deyir ki, Zəcri məzəmmət edib dedim

Zalım tərəhhüm[1] et, görürsən iztirabını

Fərzən nə qardaşı, atası, nə pənahi var

Axı yətimə qızdı, yanıqlı niqahi[2] var

Bir ah çəksə gər, təhi dildən[3], bu mehriban

Afaqi(۴) yandırar elə suzəndə(۵) ahi var

Nifrin edə Yəzidi, görərsən bir anidə

Nə qaldı taci-o-təxti, nə də barigahi var

(Vurma bu nazənin qızı, qoy mən olum kəfil(۶



---

۱- [۲۷۲] Rəhm

۲- [۲۷۳] Baxışı

۳- [۲۷۴] Ürəkdən

۴- [۲۷۵] Üfüqləri

۵- [۲۷۶] Yandırıcı

۶- [۲۷۷] Himayədar, zamin

Tərigimdə mindirim gətirim, səxt rahi(۱) var

Əlqissə, qane oldu, qəbul etdi Zəcri dun

Çün gördü məntiqimdə rizayi ilahi var

Ərz eylədim xanım, olasan tərgimə səvar

Bu yolda xar çoxdu, nə ab-o-giyahi(۲) var

Verdi cəvab: Yaxşı mürüvvətli şəxssən

Amma bu yerdə məntiqinin iştibahı(۳) var

Naməhrəmilə bir ata minməz, Hüseyn qızı

Əmməm deyib, bu əməlin çox günahı var

Olduq səvar Zəcrilə biz, başladıq yolu

Gördüm nə fikri rahəti dil, nə rifahi var

Hərdəm dönüb dala baxıram, görürəm onu

Ney tək vəli sızıltısının gah-gahi var

Guya ayaqların qabar almış, üzün ğübar

Zahirdə təkdi vəli başda ğəm sipahi(۴) var

Bir qarə məcərilə iki iş görür o qız

Qalmış du dil(۵) ürəkdə zibəs ki, du rahi(۶) var

Gah başə bağlayır onu gahi ayağına

Gör tirə(۷) bəxti, gör necə ruzi siyahi(۸) var

Hasil, yetişdi qafiləyə ol əfifə qız

Gördüm ki, nizə başına həsrət niqahi var

Ərz eylədi, bu Zəcri baba bir məzəmmət et



---

Çətin yolu [۲۷۸] -۱

Su və bitki [۲۷۹] -۲

Səhvi [۲۸۰] -۳

Qəm qoşunu [۲۸۱] -۴

İki fikirli [۲۸۲] -۵

İki yolu [۲۸۳] -۶

Qara [۲۸۴] -۷

Qara günü [۲۸۵] -۸

Bilsinlə ta yətimələrin dadixahi(۱) var

Məndən nə rənci rah-o-biyabandan(۲) soruş

Nə suzi qəlb-o-hali pərişanidən soruş

Pərvanə sərgüzəştinə biganədir hamı

Öz aşinası şəmi şəbistanidən(۳) soruş

Bu zülmü bir yətimə heç kafər eləməz

Hər covr-o-zülmi Zəcri müsəlmanidən soruş

Bir sili vurdu Zəcr mənə, şərh edənmərəm

Zəhra anama sili vuran Sanidən soruş

Qoy üz-üzə, necə alışıb gör üzüm baba

Mümkün deyilsə dideyi giryanidən(۴) soruş

Alsan qabar ayaqlarımın halını xəbər

Yollardakı o xari müğilandan(۵) soruş

Xiclət çəkib danışmasa gər, xar-o-xəs(۶) baba

Bu yarəli ayaqdan axan qanidən soruş

Xarın ayağa batmağını istəsən əgər

Sinəndəki o zəhrili peykanidən(۷) soruş

Var şahidim ki, həm susuzam, həm acam baba

Misdaqi ərzimi ləb-o-dəndanidən(۸) soruş

Şirin dilimlə qəmçi acısın deyəmmirəm

Nili bədəndə xəstə olan canidən soruş

səh:۱۰۳

---

۱- [۲۸۶] Köməyinə yetişən

۲- [۲۸۷] Yol və səhranın əziyyətitndən

۳- [۲۸۸] Gecə məclisləri keçirmək üçün məkan

۴- [۲۸۹] Ağlar göz

۵- [۲۹۰] Tikanlı ağacın tikanlarından

۶- [۲۹۱] Tikan və quru ot

۷- [۲۹۲] Ox

۸- [۲۹۳] Dodaq və dişlər

Bəxtimdən ay da batdı, qaranlıqda ağladım

Çəkdim nələr, bu qəlbi hərasanidən soruş

Yel əsdi mən də əsdim o dəm bərgi bid(۱) tək

İndi də titrirəm, təni lərzanidən(۲) soruş

Şe’rində etmə Münzəvi, heç kimdən iqtibas(۳)

Əğyari boşla, hikməti Loqmanidən soruş

Şe’rin gərəkdi dərsini Ruhul-Qüdus verə

Nə pirdən, nə tifli dəbistanidən(۴) soruş(۵)

### Şam yolunun əhvalatı

Ey bəşər qəlbini saf eylə müsəlmansan əgər

Getmə şeytan yoluna tabeyi Qür’ansan əgər

Qoyma böhranda qala aciz-o-dərmandələri

Bəzl-o-infaq(۶) elə insanlara, insansan əgər

Olma razı balasından ola şərməndə(۷) fəqir

Dərdinə çarə elə baniyi ehsansan əgər

Qapını bağlama, Allah qapını bağlamasın

Rəhm elə, şiyeyi ğəmxari yətimansan əgər

Səngidil olma bu əndazə bir az rəhmidil ol

Yoxsulu al nəzərə, bəndeyi Sübhansan əgər

Get fəqirin evinə qoyma o gəlsin qapına

Qoyma sındırsın özün, sahibi vicdansan əgər

Bir günün vardı qabaqda, əli boş getməlisən

səh:۱۰۴

---

Söyüd yarpağı [۲۹۴] -۱

Titrəyən bədəndən [۲۹۵] -۲

Faydalanmaq [۲۹۶] -۳

Məktəb uşağından [۲۹۷] -۴

Rəhim Münzəvi Ərdəbili [۲۹۸] -۵

Bəxşiş [۲۹۹] -۶

Xəcalətli [۳۰۰] -۷

Olma məğrur tamam aləmə sültansan əgər

Fəqr bir atəşi suzandi(۱), cəhənnəm misli

Rişəkün(۲) eylə onu talibi rizvansan(۳) əgər

Hərə bir dərdə giriftaridi bu dünyadə

Dərdin artırma, dəva dərdüvə xahansan(۴) əgər

Çörəyi doğrama gündə füqəranın qanına

Bu qədər zülm eləmə sahibi imansan əgər

Çox uşaq var qara köynək ala bilmir özünə

Tut əlin nokəri-sültani-şəhidansan əgər

Qara bir köynəyi olsa qoşular dəstələrə

Fürsətin var hələ ğəm çəkmə, pəşimansan əgər

İstəyirəm indi təvəssül eliyəm, ağlaşağın

Sən də göz yaşı tök, didəsi giryansan əgər

Qara köynək yadıma saldı Rüqəyyə xanımı

Şam yollarına bax vaqifi cəryansan əgər

Karivan gördü gedib, baxdı bir az sağ-soluna

Əli qoynundə gözün tikdi Dəməşqin yoluna

Belə fikr eylədi röyadədi, ahuyi Hicaz

O xəyal ilə qara gözlərini ovdu bir az

Oyanıb gördü yatan bəxtidi, əyləşdi yerə

Əllərin başdan ucaldıb dedi: ey Bəndə Nəvaz

Səni verrəm qəsəm əllərdə ölən Zəhraya

O xanım ki, qıla bilmirdi ayaq üstə nəmaz

And verrəm babamın sinəsinin ox yerinə

O şəhanşəh ki, məqtəldə edib raz-o-niyaz

And verrəm əmim Əbbasin uzun qollarına



---

۱- [۳۰۱] Yandırıcı od

۲- [۳۰۲] Kökündən qaz at

۳- [۳۰۳] Cənnət istəyirsənsə

۴- [۳۰۴] İstəyənsən

(Demirəm eylə məni Yəsribə getməkdə mücaz(١

Harda olsa bibimi tez yetir Allah, ölürəm

Bağiban olmasa heç güldə təravət olmaz

Deyiləm özgə, Xüdaya, mən Hüseynin qızıyam

Heç şəhidin qızı mən tək belə başsız qalmaz

Dəftərin olsa əgər yazmağa bikəslər adın

Babamın adının altında mənim adımı yaz

Kaş bilirdim ki, bibim Zeynəbə mən neyləmişəm

(Məni agah elə, ey Bais Peydayişi Raz(٢

Qucağından məni əmməm yerə heç qoymaz idi

(Razı olmazdı edəm didəsi tər suz-o-güdaz(٣

Dilim-ağzım qurusun bəlkə bibim Zeynəb ölüb

Ölsə Səccadə denən, öldü bacın qəbrini qaz

Söz verrəm bibimin damənina çatsa əlim

Bir də Şamata kimi eyləmərəm heç kəsə naz

Taziyanə mənə öyrətdi yətim naz eləməz

Eyləsə nazinə heç kimsə xəridar olmaz

Hər kəsin mən kimi ölsə atası əllərdə

Olacaq ğüssələri çox vəli xoş günləri az

Əlqərəz: ağladı əzbəs Əli Əkbər bacısı

Görməyə Fatiməni aldı biyabanda cəvaz

Gördü bir orəti(۴) Zeynəb kimi qəddi bükülüb

Ağarıb saçları güya başına kül tökülüb

Qüvvəti qəlb tapıb Fatimənin tərlanı

(Tökdi göz yaşını gül surətinə müjqani(۵



---

۱- [۳۰۵] İcazəli

۲- [۳۰۶] Sirlərin açılmasının səbəbkarı

۳- [۳۰۷] Ah-nalə

۴- [۳۰۸] Qadın

۵- [۳۰۹] Kiprik kimi

Dedi kimsən bu biyabanda ey biganə

Gecənin vəqti gəzirsən niyə bu səhranı

Olmiyə sən də mən kimi qardaşın ölüb

Qardaşın ölsə çətin dərdidi yox dərmanı

Nədir illət de görüm qarə salıbsan başüvə

Dağılar ğəmlərün izhar eləsən cəryanı

Nəfəsindən bu biyabanə dolub buyi behişt[١]

Por məhəbbət baxışın məst eləyir insanı

Bu cavanlıqda nədən saçların aya ağarıb

Hansı ğəm xəm eləyibdir bu qəddi rənanı

Danışardı nənəsindən bizə Yəsribdə[٢] babam

Tanıyaq bəlkə nənəm Fatimeyi Zəhranı

Mu be mu[٣] hər nə buyurmuşdu qalıb yadımda

Çəkmişəm sinəmə vəchil-həsən cananı[۴]

Məni əfv eylə xanım olsa əgər imkanı

Bir sualım vəli var sınmasa qəlbin məndən

Yuxusuz gözlərim olsun gözlərüvin qurbani

Kim vurub surətinə sili, dolub qan gözünə

Əli sınsın vuranın, heç yox imiş vicdanı

Nənəmin də belə deylər gözünə ləkkə düşüb

Olmadı mən də görüm mahi cəhan aranı

Qismət olsa yetişəm məhzərinə rö’yadə

Gözlərimdən tökərəm damənində dəryanı

Göyərən surətini versə icazə öpərəm

Deyərəm çatdı mənə Fatimənin ehsanı



---

۱- [۳۱۰] Behişt iyi

۲- [۳۱۱] Mədinə

۳- [۳۱۲] Hamısı

۴- [۳۱۳] Gözəl üzlü cananımı

Söz yetişcək bu yerə qalmadı Zəhrada dəvam

Çəkdi ağuşinə yorğun balani eyliyə ram

Dedi: day ağlama ey bəxti, güni qarə qızım

Əlini qoynuna qoyma ürəyi yarə qızım

Toz qonub zülfünə ayineyi iqbalım tək

Bağiban olmasa xüsranidi(١) gülzarə qızım

Şanəsiz(٢) tellərinə çarəsiz əmmən qurban

Qolları bağlıdı yoxsa eliyər çarə qızım

Niyə biganə misalındə baxırsan üzümə

Surətindən telini rədd elə məhparə qızım

Yaxşı bax öz nənənə, oğlu ölən Fatiməyəm

Gəzirəm çölləri sizdən sarı avarə qızım

Xəbər aldın gözümün ləkkəsinin cərəyanın

Agah ol indi bu cəryani əsfibarə(٣) qızım

Bir günü kuçeyi Yəsribdə Həsən yanımda

Sani kəsdi yolumu baxmadı Dadarə(۴) qızım

Bimürüvvət mənə bir siliyi möhkəm vurdu

Çıxdı düşdü qulağımdan yerə guşvarə qızım

Oxşayırsan mənə fikr etmə fəqət simadan

Sərgüzəştin də mütabiqdi(۵) bu naçarə qızım

Mənə də sili dəyibdi sənə də sili dəyib

İkimiz də gəzirik çölləri avarə qızım

Qapıma vurdular od, yandı sənin də ətəyin

Yarı oxşatdı fələk, dil yaralı yarə qızım

Hər ğəmim bir yana, amma bu ğəmim bir tərəfə



---

۱- [۳۱۴] Ziyandır

۲- [۳۱۵] Daranmamış

۳- [۳۱۶] Qəmli

۴- [۳۱۷] Allah

۵- [۳۱۸] Uyğun

Yanaram həşrə kimi bu ğəmə həmvarə qızım

Nə anan, Heydəri-Kərrarə dedi sili sözün

Nə sənin çatdı əlin qolsuz ələmdarə qızım

Fərqimiz olsa vəli yaxşıdı bir mətləbdə

O da vabəstədi(١) iqbali səzavarə(٢) qızım

Mənim ömrüm az olub, kaş, səninki çox ola

Salmaya əmmələrin başlarına qarə qızım

Yazdı bu şeri Fatiməyə Ğəffari

(Eyləyə bəlkə onu beyti Xüda zəvvari.(٣

**Həzrət Rüqəyyəyə (ə) salam**

Salam ola ağamın məslək-o-əqidəsinə

(Cəmali ənvərinə, qaməti keşidəsinə(٤

Salam ola ağamın xanədani itrətinə

Gözəllərin gözəli nazidanə Əkbərinə

Salam ola ağamın zübde(٥) məhliqalərinə

Minayi eşqidə ətşan ölən fədalərinə

Salam ola ağamın teşnə zibh olan başinə

Livayi dinə mühafiz şərəfli qardaşinə

Salam ola ağamın qanə ğərq olan ləbinə

Kəfili-itrəti-Xatəm, vəfali Zeynəbinə

(Salam ola ağamın şivey-o-rəviyyəsinə(۶

Xarabalərdə ölən mehriban Rüqəyyəsinə

Ğürub olanda xanım, aşiqanə ağlardı

səh:۱۰۹

---

۱- [۳۱۹] Bağlıdır

۲- [۳۲۰] Yaxşı gələcəyə

۳- [۳۲۱] Hüseyn Ğəffari Ərdəbili

۴- [۳۲۲] Çəkilmiş qamətinə

۵- [۳۲۳] Seçilmiş

۶- [۳۲۴] Getdiyi yola

Deyərdi nohə dili masəvani(١) dağlardı

Deyərdi, bilmirəm hansı məkandasan babacan

Rüqəyyə canüvə qurban hayandasan babacan

Fəraqətin qızına eylər əsər gecələr

Sənin vüsalinə xatir ürək əsər gecələr

Nə çox səfərdə yubandın, sənə gözüm qurban

?Ata qoyar gözü yolda qızın məgər gecələr

Bu dəfə gəlsən əgər, qoymaram çıxıb gedəsən

Üç yaşlı aşiqinə çox yerin gələr gecələr

Bibim deyir, gələcək bir gecə vəfalı baban

Üzarə göz yaşını tökmə bu qədər gecələr

Diyəm ki, qorxuram əmmə gələndə yatmış olam

Odur ki, oyaq qalıram sinədə şərər gecələr

Darıxmışam babacan gəl apar məni vətənə

Qucaqə al məni, ey müjdeyi səhər gecələr

Gümanın olsa əgər, bari namə yaz göndər

Ğəm üz verəndə salım namənə nəzər gecələr

Yazanda namə Əli Əkbərində halın yaz

Rüqəyyəsiz görüm aya nə eylər gecələr

Mənim dilimcə denən, küsmüşəm Əli səndən

Demir ki, heç bacımı kimsə dindirir gecələr

Düşəndə yadımə Əkbər, sitarəyə baxaram

Günüz gedər, yenə göydə gəlib gəzər gecələr

Denən itib sən alan guşivarə, ay qardaş

Qulağımın yarası, Əkbər, incidir gecələr

Gərək dubarə mənə ayrı guşivarə ala

Salam qulağıma getsəm qonaq, əgər gecələr

Qonaq çağırsa əgər, xiş-o-əqrəba gedərəm

Qəribənin evinə salmaram güzər gecələr

Qəribələr bizi viransərada saxladılar



---

۱- [۳۲۵] Hamını

Ğəza da vermədilər qomi xeyrə sər(١) gecələr

Xaraba qonşuluğunda vəfalı bir qız var

Günüz gələr bura amma yenə gedər gecələr

Ğürub olanda babası gələr dalınca onun

Gedib yatar öz evində o bəxtəvər gecələr

Mənim vəli nə babam var, nə abırlı evim

Saray zülmət olar, çıxmasa qəmər gecələr

Gələndə görsədərəm, yoldaşım görər babamı

Ürəkdən əsgilə ğəm bəlkə müxtəsər gecələr

Sözüm uzandı baba, tari zülfi Əkbər tək

Bu rəsmidir uzanar şərhi ğüssələr gecələr

Mənim vəli baba, səndən sonra kimim vardı

Qulaq verə sözümə gözdə əşgi tər gecələr

Səni qəsəm verirəm qüssəli ölən nənənə

Qoyardı səcdəyə pişani(٢) dide tər(٣) gecələr

Anam Rübabı düa eylə harda olsan əgər

Yatıb durar yuxudan, sübhədək mələr gecələr

Qoyub qəbaqinə bir boş beşik həyalı anam

Biz ağlayanda o da lay-lay deyər gecələr

Hamı deyib yorular, gözlərin yumub yuxular

İşıqlanınca o gəhvarə tərpədər gecələr

Əsasi ğarəti(۴) Zeynəb bibim alan gündən

O qanlı qündaqi tez-tez açıb bələr gecələr.(۵)

səh:۱۱۱

---

۱- [۳۲۶] Utanmaz və özbaşına

۲- [۳۲۷] Alın

۳- [۳۲۸] Gözü yaşlı

۴- [۳۲۹] Qarət olunmuş malları

۵- [۳۳۰] Hüseyn Ğəffari Ərdəbili

### Əkbərim gəlincə ölsəm dəfnimi yumandır əmmə

Əkbərim gəlincə ölsəm, dəfnimi yubandır əmmə

Nəşimi alıb əl üstə, başinə dolandır əmmə

***

Yox sözüm bu ölmək əmmə əmri Həyyi Ləm Yəzəldi

Bacılar öləndə amma qardaşı ola gözəldi

Eyləyin bir azca təxir bəlkə Əkbərim də gəldi

Kəfn-o-dəfnimi bir az sən, saxla əl yubandır əmmə

***

Gözlərin fədası ollam, xəstəsən bibi az ağla

Öldürür özün hərəmlər, az bu qəlbi zari dağla

Əllərin qadasın allam, gəl bu gözlərimi bağla

Qanlı əşgilən saralmış rəngin az boyandır əmmə

***

Gərçi qarə gün əlindən qurtarır bu bəxti qarə

Var vəli bir ümdə dərdim, gəl sənə edim işarə

Nagəhani gəlsə Əkbər, gözlərimi aç dübarə

Əkbəri mənilə bir an, ru-bə-ru(١) dayandır əmmə

***

Şimri sən çağırma əmmə, qəlbidə cərahətim var

Qoldan açmasın tənabim, dildə ayrı niyyətim var

Qəbrə qoy bu halətilən cəddimə şikayətim var

Sən də xəlqə zülmü Şimri nitqin ilə andır əmmə

***

Başün açma etmə nalə qəlbim oldu qüssədən ğəm

Sən mənə analıq etdün, canüvə Rüqəyyə qurban

Başım alma sinən üstə, topraq üstə qoy verim can

Zəhmətimi çox çəkibsən, az məni utandır əmmə

***

Ağlama demə ğərib, bivətən Rüqəyyə lay-lay



---

Üz-üzə [۳۳۱] -۱

Heç dilə gətirmə cismi bikəfən Rüqəyyə lay-lay

Səslə Şimri şum əlindən dincələn Rüqəyyə lay-lay

Qəlbi-əhli-Şami ah atəşinə yandır əmmə

***

Bisəbəb denən bu ğəmdə qanə göz yaşım dolanmaz

Əldə öldürüb bu tifli, Şimri dun yenə utanmaz

Qəmçilər yerini amma, görməyincə xəlq inanmaz

(Köynəyim çıxart bu xəlqi sən özün inandır əmmə.(١

**Mən qalmışam səhrada əmmə getmə**

Mən qalmışam səhrada əmmə getmə

Yox bir gələn imdadə əmmə getmə

***

Qaldım mələr çöllərdə misli ahu

(Bir qorxulu səhrada por həyahu(٢

Qaçdım bir az hər səmtə dildə ya Hu

Dilxəstəyəm oftadə(٣) əmmə getmə

***

Hətmən çox incitdim səni nəvadən

Qəhr eylədin, doydun bu binəvadən

Nazım çəkibsən əmmə Neynəvadən

Biçarəyəm sal yadə əmmə getmə

***

Ğəmlər mənə üz verdi hər tərəfdən

Xaliydi səhra abiylə ələfdən

Müşgil qoşani səslərəm Nəcəfdən

Gəlməz babam fəryadə əmmə getmə

***

səh:۱۱۳

---

۱- [۳۳۲] Rəhim Münzəvi Ərdəbili

۲- [۳۳۳] Səs və fəryadla dolu

۳- [۳۳۴] Yıxılmış

Əmmə amandır saxlayın qətari

Aclıq susuzluq aldı ixtiyari

Az qaldı solsun ömrümün bəhari

Lütf eylə bu naşadə əmmə getmə

***

Çəkmək yətimin nazini çətindi

Amma yətim dürdanə Hüseyindi

Allah səni mə'cur edər yəqindi

Çox əcri var, iqabda əmmə getmə

***

Getdi əlimdən izzətim, cəlalim

Az sinnidə çoxdur, ğəmim, məlalim

Sili yerindən nilidir cəmalim

Yandım ğəmi bidadə əmmə getmə.(١)

**Qəlbində yarə öldü Rüqəyyəm**

Gözlərin yumdu dincəldi ğəmdən

Qəlbində yarə öldü Rüqəyyəm

Əkbər öləndən bağlardı qarə

Əynində qarə öldü Rüqəyyəm

Viransəralərdə can verdi həsrət

Getdi məzarə öldü Rüqəyyə

***

Arami canim, lay-lay Rüqəyyə

Şirin zəbanim lay-lay Rüqəyyə

***

Viransəranın söndü çırağı

Gəl ay Əbəlfəz matəmsərayə

Qardaşım kimi kəfənsiz öldü

Yaralı cismin bükdüm qaraya



---

۱- [۳۳۵] Hüseyn Kərimi Mərağeyi

Xəbərdar eylə məzlum atasın

Başında qarə gəlsin əzayə

***

Arami canim, lay-lay Rüqəyyə

Şirin zəbanim lay-lay Rüqəyyə

***

Həsrət baxanda canım alardı

Müjqanı[1] hər dəm qalxıb enəndə

Bir gün maralım bir söz danışdı

Qəlbim alışdı yandım mühəndə[2]

Səsləndi əmmə, guşvarəm yoxdu

Şərməndə ollam Əkbər gələndə

***

Arami canim lay-lay Rüqəyyə

Şirin zəbanim lay-lay Rüqəyyə

***

Hər gün yatanda viransərадə

Gözdən tökərdi rüxsarə qan yaş

Səslərdi tez gəl bimarın öldü

Harda qalıbsan vəfalı qardaş

Qəlbim sınıbdı tez gəl səfərdən

Salmaz nəzərdən yoldaşı yoldaş

***

Arami canim lay-lay Rüqəyyə

Şirin zəbanim lay-lay Rüqəyyə

***

Darul əzayə(۳) gəldi Hüseynin



---

Kiprikləri [۳۳۶] -۱

Qəmdə [۳۳۷] -۲

Əza evinə [۳۳۸] -۳

Yaralı başı, teşti təladə

Bikəs Rüqəyyəm pərvanə misli

Pərvazə gəldi viransəradə

Gül ləblərindən öpdü doyunca

Verdi o başı, Zeynul İbadə

***

Arami canim lay-lay Rüqəyyə

(Şirin zəbanim lay-lay Rüqəyyə(۱

**Həzrət Zeynəbin (ə) Yezidin məclisindəki xütbəsi**

Əhli beyt (ə) əsirlərini, Yezidin məclisinə gətirdilər... Yezid əlindəki çubuqla imam Hüseynin (ə) dodaqlarına və dişlərinə vururdu. Bu vaxt Peyğəmbərin (s) səhabələrindən orada olan birisi qalxıb, onun bu işinə etiraz etdi. Yezid əsəbləşərək o kişinin məclisdən çıxarılmasını əmr etdi. Sonra Yezid, Qüreyş kafirlərindən olan ibn Zəvəbinin Ühüd döyüşündə oxuduğu şerlərindən iki beyt oxudu və üç beyt də özündən artırdı: Ey kaş Bədr döyüşündə öldürülən tayfa başçılarım indi burada olub, görəydilər ki, Xəzrəc tayfası bizim qılınc zərbələrimizdən necə fəğanə gəlmişlər. Yəqin ki, bu mənzərəni görəndə sevinclə qışqırıb, deyərdilər: Sağ ol, ey Yezid! Biz Bəni Haşim böyüklərini öldürdük və onları Bədr döyüşünün hesabına yazdıq. Bu günkü gün, elə o günün əvəzidir. Mən, Əhməd övladlarından onun işlərinin əvəzini çıxmasam, Xəndəf !.övladlarından olmaram

:Bu vaxt Həzrət Zeynəb (ə) qəzəblənib yerindən qalxdı və atası Əli (ə) kimi sözə başladı

Həmd olsun aləmlərin Rəbbi olan Allaha və salam olsun Onun Peyğəmbəri və övladlarına. Allah necə də doğru səh:۱۱۶

---

.Hüseyn Ğəffari Ərdəbili[۳۳۹] -۱

buyumuşdur: Pis iş görüb, cinayətə mürtəkib olanların işlərinin aqibəti o yerə çatdı ki, Allahın ayələrini təkzib edərək, məsxərəyə qoydular.(۱) Ey Yezid, elə güman edirsən ki, yeri-göyü bizə darısqal edərək, çarə yollarını bizim üzümüzə bağlamısan və bizi əsirlər kimi gətirmisən, biz Allahın yanında xar, sən isə əzizsən? Elə güman edirsən ki, bu qələbə sənin uca məqamının bəhrəsidir? Buna görə də təkkəbbürlə öyünürsən və sevinirsən ki, dünya sənə üz gətirib, sənin işlərini düzəldib, sənə sültanlıq və şahlıq ?verib

Bir az yavaş! Allahın buyurduğunu yaddan çıxarmısan ki, buyurur: Küfr yoluna gedənlər güman etməsinlər ki, onlara verdiyimiz bir neçə günlük möhlət, onların xeyrinədir! Yox, verilən bu fürsətlər onların günahlarının çoxalması üçündür və onlar (üçün xaredici əzablar vardır.(۲

Ey azad olunmuşların oğlu! Bu ədalətdəndir ki, öz arvadlarını və kənizlərini pərdə arxasında oturdasan, Peyğəmbərin (s) qızlarını isə əsir edib, açıq üzlə, hicabsız şəhərbəşəhər gəzdirirsən ki, hamı onları görsün və eləcə də alçaq və şərafətli adamlar .onlara baxsın? Bir halda ki, onları himayət edən kişilərdən heç biri sağ qalmayıb

Anası, pak insanların ciyərini çeynəyən, əti, qanı şəhidlərin qanından əmələ gələn adamların rəhminə necə ümid bəsləmək olar? Bu rəftar, həmişə bizə düşmən gözü ilə baxan bir şəxsdən uzaq deyil. Bu böyük günahda özünü günahkar saymırsan və bu yaramaz əməlindən utanmırsan, öz kafir babalarını çağırırsan ki, gəlib, sənin rəhm etmədən öldürdüklərini görüb sevinələr və sənə təşəkkür edib deyələr ki, sağ ol ey !Yezid



---

.Rum surəsi: ayə ۱۰[۳۴۰]-۱

.Ali İmran surəsi: ayə ۱۷۸[۳۴۱]-۲

Çubuqla, behişt cavanlarının ağası, Əba Əbdillahın (ə) dodaqlarına və dişlərinə vurursan! Niyə də belə etməyəsən və deməyəsən. Çünki, yaraları qopartdın və kökünü qazdın, Peyğəmbərin (s) övladlarını qanını tökdün, bir halda ki, onlar Əbdül-Mütəllib nəslindən və yer üzünün ulduzları idilər. İndi də öz ölənlərini çağırırsan.

Səbr etmək lazımdır, çünki çox çəkməz ki, sən də öz ölülərinə qoşularsan, arzu edərsən ki, ey kaş əllərin quruyaydı və dilin lal olaydı, o sözü dilinə gətirməyəydin, o yaramaz işi etməyəydin!

İlahi! Bizim haqqımızı və intiqamımızı bunlardan al, bizim qanımızı tökən bu zalımlara öz qəzəb və əzabını göndər!

And olsun Allaha, ey Yezid! Öz dərini yırtdın və bədəninin ətini para-para etdin. Çiynindəki bu ağır yükünlə, Allah Peyğəmbəri (s) ilə görüşəcəksən. O həzrətn övladlarının qanını tökdün və onların hörmətini saxlamadın, onun övladlarını əsir etdin. Bir halda ki, Allah onların haqqında buyurur: Elə güman etmə ki, Allah yolunda öldürülənlər, ölüdürlər. Yox, onlar diridirlər və Allahın yanında Onun ruzilərindən bəhrələnirlər(۱) Bu bəsdir ki, Allah hakim və Mühəmməd (s) əhli beytin düşmənləri ilə düşmən və Cəbrail (ə) Peyğəmbərin (s) köməkçisidir. Yolu sənin üçün hamar edib, açan və səni müsəlmanlara müsəllət edən şəxs, tezliklə zülmkarların cəzasının necə ağır bir cəza oduğunu biləcək. Biləcək ki, sizin hansınız daha pis və daha zəifsiniz.

Dövranın müsibətləri məni səninlə danışmağa məcbur etdi. Amma mən səni dəyərsiz, səni danlamağı isə çox böyük bilirəm və səni çoxlu danlayıram. Nə edim?! Gözlər



---

۱- [۳۴۲] Ali İmran surəsi: ayə ۱۶۹.

ağlar, ürəklər isə yanıqlıdır. Olduqca təəccüblüdür ki, Allah qoşunu, şeytan qoşununun əli ilə öldürülə və bizim qanımız sizin pəncələrinizdən tökülə, və bədənimizin ətinin tikələri sizin ağzınızdan çölə düşə və o pak və mütəhhər bədənləri biyabanın vəhşi .canavarları tapalar və yırtıcı heyvanların yolu oradan düşə

Bu gün qənimət bildiyin, sabah sənin üçün ziyan və zərərdir. Özündən qabaq göndərdiyin şeyi orada tapacaqsan. Allah bəndələrə zülm etməz.(١) Allahı əzəmətli bilir və ona etimad edirik. Bəs (ey Yezid), bütün hiylə və məkrlərini işə sal, bacardığını et, bütün səyini göstər. And olsun Allaha, heç vaxt bizi insanlara unutdura və onların ürəyindən çıxara bilməyəcək və bizim vəhy nurumuzu söndürə bilməyəcəksən. Bizim izzətimizi dərk edə bilməyəcəksən, bizə etdiyin zülmün rüsvaylıq ləkəsini, öz ətəyindən yuya bilməyəcəksən. Sənin rə’y və fikrin etibarsız, hökumətinin ömrü az, cəmiyyətin isə pərişan olacaqdır. Bir gün gələcək ki, nida edən səsləyib deyəcək: الا لعنه الله عل القوم

الظلمين Allah zülmkarlara lənət etsin

Həmd olsun aləmlərin Rəbbi olan Allaha ki, bizim əvvəlimizi səadət və məğfirət, axırımızı isə şəhadət və rəhmət qərar verdi. Allahdan istəyirik ki, onların savabını kamil etsin və əcrlərini artırsın. Allahın özü bizim üçün ən gözəl xəlifədir və O Mehribanların Mehribanıdır və yalnız Ona təvəkkül edirik.(٢)



---

١- [٣٤٣] Füssilət surəsi: ayə ٤٦.

٢- [٣٤٤] Biharul-ənvar, ٤٥-ci cild.

Həzrət imam Səccad (Allahın salamı olsun ona), Yeziddən cümə günü məsciddə xütbə oxumağına icazə aldı. Yezid razı oldu. Cümə günü çatdıqda, Yezid öz xətiblərinin birini minbərə göndərdi. O, xətibə əmr etdi ki, Əli (ə) və Hüseyn (ə) barəsində nalayiq sözlər .desin, Əbu Bəkr, Ömər və Yezidi tərif etsin. Xətib də belə etdi

İmam Səccad (ə), Yeziddən öz vədəsinə vəfa etməyini istədi. Yezid imama verdiyi vədədən peşiman olmuşdu və icazə vermək istəmirdi. Yezidin oğlu Müaviyyə, atasına .dedi: Bu kişinin xütbəsinin nə təsiri ola bilər? Qoy nə istəyir, desin

Yezid dedi: Siz bu ailənin qabiliyyətlərini yaxşı tanımırsınız. Onlar elm və fəsahəti bir-.birindən irs aparırlar. Qorxuram onun xütbəsi şəhərdə fitnə qaldırsın

Buna görə də Yezid, imamı xütbə oxumağa qoymaq istəmirdi. Amma, camaat hər tərəfdən Yeziddən imam Səccadın (ə) minbərə getməsinə razı olmasını. israrla .istədilər

Yezid dedi: O, minbərə getsə, məni və Əbu Süfyan nəslini rüsvay etməyincə aşağa .düşməyəcək

!?Yezidə dedilər: Bu yeniyetmə nə edə bilər

.Yezid dedi: O bir ailədəndir ki, südəmər vaxtlarından elmdən bəhrələniblər

Camaat bir az da israr etdilər. Nəhayət, Yezid onların israrlarının qarşısında davam .gətirməyib, imam Səccadın (ə) minbərdə xütbə oxumasına razı oldu

:İmam Səccad (ə) minbərə çıxıb buyurdu

Əzəli və əbədi olub, başlanğıcı olmayan Allaha həmd olsun. O, hər şeydən əvvəl var idi, .hər şeydən sonra da olacaq. Bütün məxluq fani olduqdan sonra O, qalacaqdır

Ey camaat! Allah bizə altı xislət əta edib; elm, səbr, səxavət, fəsahət, şücaət və möminlərin qəlbində bizə qarşı məhəbbət.

Bizi başqalarından yeddi xüsusiyyət ilə üstün etdi; Allah Peyğəmbəri Mühəmməd (s) bizim ailəmizdən seçilmişdir, Siddiq (Əli) bizdəndir, Təyyar bizdəndir, Allah şiri və Allahın Peyğəmbərinin (s) şiri (Həmzə) bizdəndir, behişt cavanlarının iki ağası imam Həsən (ə) və imam Hüseyn (ə) bizdəndir, bu ümmətin imam Qaimi (ə) bizdəndir.

Hər kim məni tanıdı, tanıdı, tanımayanlara isə atamı, nəslimi və özümü tanıtdırıram.

Ey camaat! Mən Məkkə və Minanın oğluyam. Mən Zəmzəm və Səfanın oğluyam. Mən · o kəsin oğluyam ki, həcərül-əsvədi əbasında aparıb, (Kəbədə) öz yerinə qoydu. Mən ən gözəl şəkildə həcc əməlini yerinə yetirən və ləbbeyk deyənin oğluyam. Mən o kəsin oğluyam ki, Büraqa səvar oldu. Mən o Peyğəmbərin oğluyam ki, bir gecədə Məscidul-Həramdan, Məscidul-Əqsaya getdi. Mən o kəsin oğluyam ki, Cəbrail onu Sidrətul-Müntəhaya apardı və Mütəal-Allaha ən yaxın olan məqama çatdı. Mən o kəsin oğluyam ki, göylərdə mələklərlə namaz qıldı. Mən o kəsin oğluyam ki, Əzəmətli Allah, ona vəhy nazil etdi. Mən Mühəmməd Müstəfanın oğluyam, mən Mürtəza Əlinin oğluyam. Mən o kəsin oğluyam ki, (Allaha) boyun əyməyənlərin boynunu əydi və La ilahə illəllahı onlara iqrar etdirdi. Mən o kəsin oğluyam ki, Peyğəmbərin yanında iki qılınc və iki nizə ilə vuruşurdu, iki dəfə hicrət və iki dəfə biət etdi, Bədrdə və Hüneyndə kafirlərlə döyüşdü, bir an belə olsun Allaha küfr etmədi. Mən möminlərin ən yaxşısının, peyğəmbərlərin varisinin, müşrikləri

məhv edənin, müsəlmanların əmirinin, cihad edənlərin nurunun, ibadət edənlərin zinətinin, ağlayanların iftixarının, səbirlilərin səbirlisinin, namaz qılanların ən üstününün, Allah Peyğəmbərinin əhli beytinin oğluyam. Mən o kəsin oğluyam ki, Cəbrail onu qüvvətləndirdi və Mikail ona kömək etdi. Mən o kəsin oğluyam ki, müsəlmanların hərəmindən himayət etdi, mariqin,(١) nakisin,(٢) qasitinlə(٣) vuruşdu və müsəlmanların düşmənləri ilə mübarizə etdi. Mən Qüreyşin ən yaxşısının oğluyam. Mən o kəsin oğluyam ki, Allah və Peyğəmbərin dəvətini qəbul edən ilk mömin olmuşdur. Mən imanda ən öndə olanın, təcavüzkarların belini sındıranın, müşrikləri məhv edənin oğluyam. Mən o kəsin oğluyam ki, münafiqlərə qarşı Allahın atdığı ox idi və abidlərin hikmət dili, Allah dininin köməkçisi, Allah əmrlərinin vəlisi, Allah hikmətinin xəzinəsi və Allah elminin daşıyıcısı idi. O, cəvanmərd, səxavətli, gözəl üzlü, xeyirlər mənbəyi, seyid, ağa, Allah razılağına razı olan, çətinliklərdə önə keçən, səbirli, həmişə oruc, bütün çirkinliklərdən pak, çox namaz qılan idi. O, düşmənlərin nəslinin kökünü kəsdi və küfr qoşununu pərakəndə etdi. O, sabit ürəkli, möhkəm iradəli və əzmli idi. Şücaətli bir şir kimi idi ki, döyüşdə atlar çapılan və nizələr bir-birinə toqquşan zaman, onları dəyirman kimi xurd-xəşil edib, külək kimi ətrafa səpirdi. Hicazın şiri, İraqın ağası, Məkkəli, Mədinəli, Xifli, Əqəbəli, Bədrli,



---

١- Cəməl döyüşü[٣٤٥]

٢- Siffeyn döyüşü[٣٤٦]

٣- Nəhrivan döyüşü[٣٤٧]

Ühüdlü, Şəcərli və mühacirdən idi və bütün bu səhnələrdə iştirak etmişdi. O ərəbin seyidi, iki məş’ərin(۱) varisi və Həsən və Hüseynin atasıdır. Bu mənim cəddim Əliyyibni .əbi Talibdir

.Sonra buyurdu: Mən, bütün cahan qadınlarının xanımı Fatimeyi Zəhranın oğluyam

İmam Səccad (ə) o qədər belə iftixarlı sözlər dedi ki, axırda camaatın şivən və ağlamaq səsi ucaldı. Yezid bunu görüb, narahat oldu və camaatın ona qarşı qiyam edəcəyindən qorxub, müəzzinə azan verməyi əmr etdi. O, bu hiyləsi ilə imam Səccadı (ə) .sakitləşdirmək istəyirdi

Müəzzin qalxıb, azana başladı. Allahu Əkbər. İmam Səccad (ə) buyurdu: Allah hər .şeydən böyükdür

Müəzzin dedi: Əşhədu ənla ilahə illəllah. İmam Səccad (ə) buyurdu: Tüküm, dərim, ətim .və qanımla şəhadət verirəm ki, Allahdan başqa mə’bud yoxdur

Müəzzin dedi: Əşhədu ənnə Mühəmmədər-rəsulullah. İmam (ə) üzünü Yezidə döndərib, buyurdu: Bu adı çəkilən Mühəmməd mənim cəddimdir ya sənin cəddin? Əgər öz cəddin olduğunu iddia etsən, yalan dedin və kafir oldun. Yox, əgər mənim ?cəddimdirsə, nə üçün onun övladlarını öldürdün və onları qılıncdan keçirdin

(Sonra müəzzin azanı davam etdirdi və Yezid qabağa keçib namaza başladı.(۲

Başqa rəvayətdə gəlib: Elə ki, müəzzin dedi: Əşhədu ənnə Mühəmmədər-rəsulullah, imam Səccad (ə) əmmaməsini başından götürdü və müəzzinə dedi: Səni and verirəm Mühəmmədin haqqına, bir anlığa sakit ol. Sonra üzünü Yezidə tutub, dedi: Ey Yezid! Bu adı çəkilən



---

.İki Məşər: ya iki behişt mənasınadır, ya da Müzədləfə və Ərəfatdır[۳۴۸] -۱

.Biharul-ənvar, ۴۵-ci cild[۳۴۹] -۲

Peyğəmbər (s), mənim cəddimdir ya sənin cəddin? Əgər öz cəddin olduğunu desən, hamı bilər ki, yalan danışırsan. Yox, əgər mənim cəddimdirsə, bəs nə üçün mənim ?atamı zülm ilə öldürdün və malını qarət, əhli-əyalını isə əsir etdin

İmam bunları deyib, yaxasını açdı və ağlamağa başladı. Sonra buyurdu: And olsun Allaha, əgər yer üzündə cəddi Peyğəmbər (s) olan bir şəxs varsa, o mənəm! Bəs nə ?üçün bu (Yezid) atamı öldürdü və bizi rumlular kimi əsir etdi

Sonra buyurdu: Ey Yezid! Bu qədər cinayətləri etmisən və yenə də deyirsən, Mühəmməd (s) Allahın rəsuludur və üzü qibləyə dayanırsan? Vay olsun sənə! Qiyamət .günü atam və cəddim səninlə düşmən olacaqlar

Yezid fəryad çəkib, dedi: Müəzzin azanı de. Camaat arasında hay-küy qalxdı, bəziləri (Yezidlə namaz qıldılar, bəziləri isə namaz qılmadan dağılışdılar.(١

Həzrət Zeynəbin (ə) və həzrət imam Səccad Zeynul-Abidinin (ə) şamlıların arasında oxuduqları güclü xütbələrindən, və həzrət Rüqəyyənin (ə) məzlumcasına xarabada can verməsindən sonra camaat həqiqəti başa düşdülər, Bəni Üməyyə aparatının hiylə .və siyasətlərinin üstü açıldı və artıq hamı Yezidə lənət göndərir, tə’nə edirdi

Yezid özünü çarəsiz gördü və bildi ki, camaat ona nifrət edirlər. Ona görə də bu .cinayəti qoşun başçılarının boynuna atdı

Camaat arasında söhbət ancaq Yezidin zülmündən gedirdi. Onlar, Yezidin Peyğəmbər (s) övladlarını öldürməsindən və onun əhli-əyalını əsir etməsindən danışırdılar. Yezid camaatın ona qarşı qiyam edəcəyindən



---

.Nəfsul-məfhum", səh. ۴۵١ -١

qorxub, Kərbəlada iştirak edən qoşun başçılarını; Şibs ibn Rəbi, Məsaib ibn Vəhibə, Şimr ibn Zil Coşən, Sinan ibn Ənəs, Xuli ibn Yəzid, Qeys ibn Rəbi və başqalarını bir yerə topladı. O, əvvəl Şibs ibn Rəbidən soruşdu: Hüseyni (ə) sən öldürdün? Rəbi dedi: Hüseynin (ə) qatilinə Allah lənət etsin, mən onu öldürməmişəm.

Yezid dedi: Bəs Hüseynin (ə) qatili kimdir? Rəbi dedi: Məsaib ibn Vəhibə. Yezid həmin sualı ondan soruşduqda, Məsaib də Rəbi kimi cavab verdi. Yezid bu sualı hansından soruşurdusa o, bu cinayəti öz boynundan atır, başqasını günahlandırırdı. Növbət Xuliyə çatdı. O, cavab verməkdən aciz qalmışdı. Bütün əmirlər vəhşət və nigəranlıqla ona göz dikmiş və qəti cavab gözləyirdilər. Birdən hamısı dedilər: Hüseynin (ə) qatili Qeys ibn Rəbidir.

Yezid, ağır sözlərlə ona həmlə etdi və dedi: Hüseyni (ə) sən öldürdün? Qeys dedi: Mən əsil qatili yaxşı tanıyıram. Amma əmir aman verməsə deməyəcəyəm. Yezid ona aman verdi. Rəbi dedi: Ey əmir! Hüseynin (ə) qatili döyüş bayrağını qaldıran və onunla (Hüseynlə) döyüşə dəstə-dəstə qoşun göndərən o kəsdir. Yezid dedi: O kəs kimdir? Qeys dedi: Ey əmir, Hüseyni (ə) sən öldürdün! (١)

**Nahiyeyi Müqəddəsə ziyarəti**

Salam olsun Allahın yaratdıqları içindən seçilmiş Adəmə.

Salam olsun Allahın vəlisi və seçilmişi Şeysə.

Salam olsun Allah höccətini bərpa edən İdrisə.

Salam olsun duası qəbul olunmuş Nuha.

Salam olsun Allah tərəfindən çoxlu köməklər alan Huda.



---

١- Nasixut-təvarix[٣٥١]

.Salam olsun Allahın kəramət tacı bağışladığı və böyük saydığı Salehə

.Salam olsun Allahın xüsusi dostluq etdiyi İbrahimə

.Salam olsun Allahın behişt qurbanlığı fəda etdiyi və onu azad etdiyi İsmailə

.Salam olsun Allahın peyğəmbərliyi onun nəslində qərar verdiyi İshaqa

.Salam olsun Allahın Öz rəhməti ilə gözünün nuru yenidən qaytarılan Yəqubə

.Salam olsun Allahın Öz əzəməti ilə quyudan nicat verdiyi Yusifə

.Salam olsun Musaya ki, Allah öz qüdrəti ilə onun üçün dəryanı yardı

. Salam olsun Allahın peyğəmbərliyinə məxsuslanan Haruna

.Salam olsun Şüeybə ki, Allah ona ümmətinə qarşı kömək etdi

.Salam olsun Allah tərəfindən tövbəsi qəbul edilən Davuda

.Salam olsun Allah Öz izzəti ilə cinləri ona aciz edən Süleymana

.Salam olsun Allahın xəstəlikdən şəfa bağışladığı Əyyuba

.Salam Allah Öz vədəsini onun üçün vəfa etdiyi Yunusə

.Salam olsun Allah onu öldürdükdən sonra bir də diriltdiyi Üzeyrə

.Salam olsun qəm və möhnətlərə səbr edən Zəkəriyyəyə

.Salam olsun Yəhyaya ki, şəhid olduğu üçün Allah onu özünə yaxın etdi

.Salam olsun ruhullah və kəlimətullah olan İsaya

.Salam olsun Allahın həbibi və seçilmişi Məhəmmədə

Salam olsun Peyğəmbərlə (s) xüsusi qardaşlığı olan, Əbu Talibin oğlu Əmir-əl-.möminin, Əliyə

.Salam olsun Peyğəmbərin (s) qızı Fatimeyi Zəhraya

.Salam olsun atasının vəsisi və canişini Əbu Mühəmməd Həsənə

Salam olsun Hüseynə ki, onun nəfsi, qanının (həqq yolunda) tökülməsi ilə böyüklük .etdi

.Salam olsun o kəsə ki, Allaha gizlində və aşkarda itaət etdi

.Salam olsun o kəsə ki, Allah şəfanı onun qəbrinin torpağında qərar verdi

.Salam olsun o kəsə ki, şərəfli günbəzinin altında Allah düaları qəbul edir

.Salam olsun o kəsə ki, imamlar onun nəslindəndir

.Salam olsun sonuncu peyğəmbərin oğluna

.Salam canişinlərin seyidinə

.Salam olsun Fatimeyi Zəhranın oğluna

.Salam olsun Xədiceyi Kübranın oğluna

.Salam olsun Sidrətul-Müntəhanın oğluna

.Salam olsun Cənnətul-Mə’vanın (əbədi behişt) oğluna

.Salam olsun Zəmzəm və Səfanın oğluna

.Salam olsun qanına boyanana

.Salam olsun xeymələrinə hörmətsizlik olunana

.Salam olsun Kisa əshabının beşincisinə

.Salam qəriblər qəribinə

.Salam olsun ən yaxşı şəhidə

.Salam olsun haramzadələrin əli ilə öldürülənə

.Salam olsun o kəsə ki, göylərin mələkləri ona ağladılar

.Salam olsun o kəsə ki, övladları ən pak insanlar idilər

.Salam olsun dinin padişahına

.Salam olsun Allahın aydın dəlillərinin mənzillərinə

.Salam olsun imamlara və ağalara

səh:۱۲۷

.Salam olsun sinələri qana boyananlara

.Salam olsun susuzluqdan quruyan dodaqlara

.Salam olsun ayrılan canlara

.Salam olsun aparılan ruhlara

.Salam olsun üryan qalan bədənlərə

.Salam olsun aclıqdan rəngi qaçmış bədənlərə

.Salam olsun olsun axan qanlara

.Salam olsun kəsilmiş əzalara

.Salam olsun nizəyə vurulmuş başlara

.Salam olsun hicabları əllərindən alınmış qadınlara

.Salam olsun aləmlərin Rəbbinin höccətinə

.Salam olsun sənə (ey Hüseyn) və sənin pak ata və babalarına

.Salam olsun sənə və sənin şəhadəttələb övladlarına

.Salam olsun sənə və sənin köməkçi nəslinə

.Salam olsun sənə və sənin qəbrinin ətrafındakı mələklərə

.Salam olsun məzlumcasına öldürülənə

.Salam olsun zəhərlə öldürülmüş qardaşına (imam Həsənə). Salam olsun Əli Əkbərə

.(Salam olsun balaca südəmərə (Əli Əsğərə

.Salam olsun libasları qarət olunmuş bədənlərə

.Salam olsun Peyğəmbərə (s) ən yaxın nəsilə

.Salam olsun səhralarda yerdə qalanlara

.Salam olsun öz vətənlərindən uzaq düşənlərə

.Salam olsun kəfənsiz dəfn olunanlara

.Salam olsun bədənlərdən ayrılan başlara

.Salam olsun o kəsə ki, müsibətlərə Allaha xatir dözdü və səbrli idi

.Salam olsun məzlum öldürülənə və köməksiz qalana

.Salam olsun o kəsə ki, pak torpaqda sakin oldu

.Salam olsun əzəmətli günbəz sahibinə

.Salam olsun o kəsə ki, Cəlil Allah onu pak qərar verdi

.Salam olsun o kəsə ki, Cəbrail onunla fəxr edirdi

.Salam olsun o kəsə ki, Mikail beşiyində ona lay-lay deyirdi

.Salam olsun o kəsə ki, onunla bağladıqları əhdi pozdular

.Salam olsun o kəsə ki, hörmətini saxlamadılar

.Salam olsun o kəsə ki, qanını nahaq və zülm ilə tökdülər

.Salam olsun o kəsə ki, nizələrələ vururdular

.Salam olsun o kəsə ki, ona zülm etdilər və qanını tökməyi halal saydılar

Salam olsun o kəsə ki, hamının gözü qarşısında başını bədənindən ayırdılar və heç kim .bir söz demədi

.Salam olsun o böyük şəxsiyyətə ki, kənd camaatı dəfn etdilər

.Salam olsun o kəsə ki, boynunun damarlarını kəsdilər

.Salam olsun köməksiz qalan himayətçiyə

.Salam olsun saqqalı qana boyanana

.Salam olsun üzü torpağa boyanana

.Salam olsun o bədənə ki, libaslarını qarət etdilər

.Salam olsun o mübarək dişlərə ki, çubuqla (xeyzəran) vururdular

.Salam olsun nizədə yuxarı qaldırılmış başa

.Salam olsun səhralarda libassız qalmış bədənlərə

Salam olsun sənə, ey mənim mövlam və şərəfli günbəzinin ətrafında qanad açan mələklərə ki, pak qəbrini dövrələyiblər və sənin hərəminin təvafına məşğuldurlar və

.ziyarət etmək üçün daxil olurlar

Salam olsun sənə. Mən səni ziyarət etmək qəsdi ilə gəlmişəm və ümidvaram sənin .yanında doğruçu olam

Salam olsun sənə. Bir kəsin salamı ki, sənin hörmətinlə arifdir, sənin dostluğunla ixlaslıdır və sənin məhəbbətinlə səh:۱۲۹

.Allaha yaxın olmaq istəyir və səndən bizar olan, düşmənlərindən olar

Bir kəsin salamı ki, qəlbi sənin müsibətin ilə yaralıdır və səni yada salmaqla göz yaşları .axır

.Bir kəsin salamı ki, dərdli və qəmli, heyran və çarəsizdir

Bir kəsin salamı ki, Kərbəla səhrasında səninlə birlikdə olsaydı, mütləq öz canı ilə səni qılıncların zərbəsindən qoruyardı və peykərində qalmış yarı canını sənə xatir ölümə verərdi və sənin qarşında döyüşərdi, zülmkarların qarşısında sənə kömək edərdi, ruhunu, cismini, malını və övladlarını sənə fəda edərdi və öz ruhunu sənin ruhuna fəda .edərdi, öz ailəsinə sənin ailəni qorumağı tapşırardı

Düzdür ki, dövran məni sənin zamanından uzaq edib və müqəddəratımı sənə kömək etməkdə tə’xirə saldı, səninlə döyüşməyə gələnlərlə döyüşə bilmədim və düşmənlərinlə dava edə bilmədim, lakin hər gecə-gündüz sənə nalə və fəğan edirəm .və (o qədər ağlayıram ki,) göz yaşı yerinə qan ağlayıram

Sənə çəkdiyim həsrətdən və çəkdiyin əziyyətlərə etdiyim təəssüflərdən tabsız və .taqətsiz qalıram, ta o vaxta qədər ki, bu müsibət və qəmlərdən ölərəm

Şəhadət verirəm ki, sən namazı bərpa etdin və zəkatı verdin, əmr be məruf, nəhy əz münkər etdin, pisliklərin qarşısını aldın. Allaha itaət etdin və Ona itaət etməkdən boyun .qaçırmadın. Allaha və Onun dəstəyinə söykəndin, belə ki, Onu özündən razı etdin

Bir halda ki, sən Allahdan qorxurdun və Ona cavab verdin (əmrini yerinə yetirdin), sünnələri və müstəhəbbləri yerinə yetirdin. Fitnələri yatırtdın və (insanları) kamilliyə doğru çağırdın. Möhkəm yolları aşkarladın. Allah yolunda haqq olaraq sə’y və cihad etdin. Allah üçün gözəl itaətçi oldun və cəddin Mühəmməddən (Allahın salam və rəhməti

ona və pak ailəsinə olsun) tabeçilik edirdin, atanın dediklərini eşidirdin, qardaşının .vəsiyyətinə əməl etməyə tələsirdin

Dinin sütunlarını qaldırdın, tüğyan edənləri əzdin. İslam ümmətinə xeyirxahlıq etdin və şəhid olmaq arzusunda idin, fasiqləri mübarizəyə çağırırdın. Allah höccətlərini bərpa etdin, İslam və müsəlmanlara mehriban və rəhm edən, haqqa yardımçı idin. Bəlalara .səbr edən, dinə gözətçi və dini mərkəzlərin müdafiəçisi idin

Sən, hidayəti qoruyan və ona yardım edən, ədaləti genişləndirən və yayan, dinin .yardımçısı və onu aşkar edənsən

.Dini əllərində oyuncağa çevirənlərin qarşısını aldın və onlara mane oldun

.Zəiflərin haqqını sərvətlilərdən alırdın. Güclü və zəif arasında bərabər hökm edirdin

Sən yetimlərin baharı və camaatın pənah yeri, İslamın izzəti, hökmlərin mə’dəni, .bəxşiş və ehsan sahibi idin

.Cəddin və atanın yolu ilə gedən, qardaşın kimi atanın vəsiyyətində qalan idin

Əhdlərə vəfa edən, yaxşılıqları sevən, kərəmləri aşkar edən, qaranlıqlarda ibadətə çalışan, ədalətli və ortaq üslubları olan, kərim əxlaqlı, işıqlı keçmişi olan, şərəfli nəsəbi, üstün əba-əcdadlı, uca rütbəsi, çoxlu iftixarları, vəsf etməli rəftarı olan, çoxlu bəxşiş edən idin. Kamala çatmış həlim, bəxşişi və elmi çox, qüdrətli, şəhid rəhbər, Allaha tərəf .qayıdan və heybətli dost idin

Sən, Peyğəmbərə (Allahın salam və rəhməti olsun ona və onun pak ailəsinə) övlad, .Qür’ana dayaq, ümmətə güclü qol və yavər idin

Sən Allaha itaət etməkdə çalışqan, Onunla bağladığın əhd və peymanı (Zər aləmində) .qoruyan, fasiqlərin yolundan uzaq və Allah yolunda var gücünlə çalışan idin

Sən uzun rüku və səcdələr edən və dünyaya qarşı etinasız idin. Elə bir etinasız ki, onu (dünyanı) buraxmaq və oradan köçmək istəyir. Həmişə dünyaya qorxmuşların gözü ilə baxırdın. Dünya arzularını ürəkdən çıxatmışdın və sənin hümmətin dünya zinətlərindən üz çevirmişdi. Sən dünya sevinc və şadlıqlarından göz yummuşdun. Sənin şövqün tanıdığın axirətə tərəf idi. O vaxta qədər ki, zülmkar zülm əlini uzatdı və zülm pərdəsini üzündən açdı və öz azğın ardıcıllarını çağırdı. Bir halda ki, sən öz ceddinin hərəmində sakin idin və zülmkarlardan uzaq gəzirdin, mehrab və evlə munis olmuşdun, şəhvət və ləzzətlərdən uzaq idin. Taqət və imkanın qədər, ürək və dilinlə pisliyi pis bilirdin. Sonra elm və agahlığın lazım bildi ki, zülmkarlara qarşı çıxasan və facirlərlə cihad edəsən. Onda övladların, ailən, şiələrin və dostlarınla yola düşdün, .həqiqət və Allahın aydın dəlillərini üzə çıxartdın, aşkarladın

Camaatı hikmət və nəsihətlə yaxşılığa tərəf dəvət etdin. Onları Allah qanunlarına əməl etməyə, Məbuda, itaət etməyə əmr etdin. (Onlara) Pis işləri və həddi aşmağı qadağan .etdin

.Onlar isə zülm və düşmənçiliklə sənin qarşında dayandılar

Sən onları nəsihət etdikdən, (pis) işlərinin qarşısında dayandıqda, höccəti tamam etdikdən və onlarla cihad etdikdən sonra, onlar səninlə peymanı və bi’əti sındırdılar, .Sənin Rəbbini və ceddini qəzəbləndirdilər, səninlə döyüşə qalxdılar

Sən onların qılınc və nizə zərbələrinin qarşısında möhkəm dayandın. Facir və günahkarların qoşununu bir-birinə vurdun, toz-torpaq qalxmış cihad meydanına .Zülfüqar ilə daxil oldun. Elə bil Allahın seçilmişi Əli (ə) idin

Onlar səni sabitqədəm və dəlir gördükləri zaman və bir halda ki, sənin də heç bir qorxun yox idi, sənə hiylə tələləri qurdular. Şər və məkr ilə səninlə döyüşdülər. O məl'un (Ömər Sə'd), öz qoşununa sənin su içməyinin və suya daxil olmağının qarşısını .almağı əmr etdi

Səninlə davaya qalxdılar və bu işdə tələsdilər (tələsirdilər). Sənə oxlar və daşlar atdılar. .Yırtıcı əllərini sənə tərəf uzatdılar

Sənin haqqını riayət etmədilər. Sənin əzizlərini öldürməkdə və malını qarət etməkdə, .öz günahlarının cəzasından heç bir qorxuları olmadı

Sən çətinliklərdə öncül idin. Elə əziyyətlərə dözürdün ki, göylərin mələkləri sənin .səbrinə təəccüb etdilər

Düşmənlər hər tərəfdən səni dövrələdilər. Sənə ağır yaralar vurdular. Səninlə gecə arasında fasilə saldılar (yəni, sənin işini tamam etdilər və gecəyə qalmağa .(qoymadılar

Heç bir köməkçin qalmamışdı. Sən işi Allaha tapşırdın və səbr etdin. Sən, atdan yıxılana .qədər qadınları və övladlarını müdafiə edirdin

Sən yaralı bədənlə yerə yıxıldın. Atların ayaqları səni əzirdilər. Hədlərini aşanlar səni .qılınclırı ilə vururdular

Ölüm təri sənin alnına oturdu. Mübarək bədəninin sağ və solu yığılıb-açılmaqla başqa .cür olurdu. Gözünün ucu ilə xeymələrə və hərəmlərə tərəf baxırdın

Sənə ağır müsibət üz verdi) Övladların və əhli beytindən ayrılıb, özünə məşğul idin) (yəni iş o qədər

.(çətinləşdi ki, əhli-əyalın barəsində fikirləşməyə aman vermirdi

Sənin atın şivən edən və ağlar halda, sür’ətlə sənin xeymənə tərəf gəldi. Qadınlar sənin atını xəcalətli və yəhərini çevrilmiş görərkən, saçlarını üzlərinə töküb, xeymələrdən çölə çıxdılar. Üzlərini açıb, sili vururdular. Ucadan nalə edir, səni .çağırırdılar. Onlar izzətdən sonra xar olmuşdular və qətligaha tərəf qaçırdılar

Şimr sənin sinən üstə oturmuşdu. O şəmşirini sənin boğazının çökəyinə salmışdı və sənin saqqalını əlində tutmuşdu, başını iti qılancla kəsirdi. O vaxt sənin hissiyyatın işdən düşdü (yəni daha heç nəyi hiss etmədin), nəfəsin dayandı və mübarək başın nizə .başında ucaldı

Sənin əhli-əyalın qullar kimi əsir oldular, dəmir zəncirlərə bağlandılar. Heyvanların palanları üstündə güclü isti onların çöhrələrini yandırdı. Onları əlləri boyunlarına bağlı .halda səhralarda aparır və bazarlarda gəzdirirdilər

Bəs, vay olsun o fasiq günahkarlara ki, doğrudan da səni öldürməklə, İslamı öldürdülər, namaz və orucu buraxdılar. Sünnətləri və hökmləri sındırdılar, dinin və imanın sütunlarını məhv etdilər. Qüran ayələrini təhrif etdilər, zülm və düşmənçilikdə təlaş etdilər. (Səni öldürdükdən sonra) Allah Peyğəmbəri (s) tənha qaldı və sənin qanını tələb edənlərdən oldu. Bir daha Allah Əzz və Cəll kitabı (Qür’an) tərk olundu və uzaq .düşdü. Sən öldürüldükdən sonra haqqa xəyanət olundu

Sən öldürüldükdən sonra Allahu Əkbər, La ilahə illəllah, haram, halal, tənzil və tə’vil (Qür’anın mənası) yoxa çıxdı. Səndən sonra dəyişikliklər, küfr, əhəmiyyətsizlik, nəfsi .(istəklər, azğınlıqlar, fitnələr və batil üzə çıxdı (yarandı

Sənin şəhadətini xəbər verən, cəddin Peyğəmbərin (Allahın salavat və salamı ona və onun pak ailəsinə olsun) qəbrinin kənarında dayandı və göz yaşı tökən halda sənin .şəhadətini ona çatdırdı

O, deyirdi: Ey Allahın Rəsulu! Sənin nəvən və cavan (oğlun) öldürüldü. Sənin əhli beytinin hörmətini sındırdılar və mübah saydılar. Sənin övladlarını səndən sonra əsir .etdilər. Sənin ailən və yaxınların giriftar oldular

.Beləliklə, Peyğəmbər (s) pərişan oldu və qəmli-qəmli ağladı

Sənə xatir, mələklər və peyğəmbərlər o həzrətə başsağlığı verdilər. Sənə xatir anan Zəhra (Allahın salamı olsun ona) əzadar oldu. Allahın müqərrəb mələklər qoşunları, atan Əmir-əl-mömininə (ə) başsağlığı vermək üçün gəl-get etdilər. Əlayi-İlliyində sənə .matəm quruldu və sənə xatir Hurul-eynlər öz başlarına, üzlərinə vurdular

Asiman və onun sakinləri, behişt və onun xəzinədarları, dağlar və onun ətəyindəkilər, dəryalar və onun balıqlırı, behişt və onun oğlanları, Allah evi, Məqam və Məş’ərül-.həram və onun ətrafında olanlar hamısı ağladılar

İlahi! Bu şərəfli məkanın (imam Hüseynin (ə) hərəmi) hörməti xatirinə, Məhəmməd və onun pak övladlarına salam göndər və məni onların zümrəsində məhşur elə və məni .onların şəfaəti ilə behiştə daxil et

İlahi! Mən sənə təvəssül edirəm; ey Çox Tez Hesab Çəkən və ey Kərimlərin Kərimi, .Hakimlərin Hakimi

Sənin bütün aləmlərə göndərdiyin peyğəmbərlərin sonuncusu Mühəmmədə və onun qardaşı və əmisi oğluna, bütlərə pərəstiş etməyən və elmlə dolu, o uca məqamlı Əmir-əl-mömin Əliyə və bütün aləmlərin qadınlarının xanımı, Fatiməyə, pak olan və təqvalıların pənah yeri, Həsənə, şəhadəttələblərin ən əzizi Əba Əbdillahil-Hüseynə

və şəhid övladlarına və məzlum ailəsinə, ibadət edənlərin zinəti, Əliyy ibnil-Hüseynə, tövbə edənlərin qibləsi, Mühəmməd ibn Əliyə, doğruçuların ən doğruçusu, Cəfər ibn Mühəmmədə, höccətləri aşkar edən, Musa ibn Cəfərə, dinin köməkçisi, Əliyy ibn Musaya, hidayət edənlərin ağası, Mühəmməd ibn Əliyə, zahidlərin ən zahidi Əliyyibni Mühəmmədə və canişinlərin varisi, Allahın bütün məxluqlarının höcəti Həsən ibn Əliyə .təvəssül edirəm

Mühəmməd və onun pak ailəsi olan doğruçular, yaxşı əməl sahibləri, Taha və Yasin övladlarına salam göndər və məni Qiyamətdə amanda olanlardan, asudələrdən, .doğruçulardan, sevinənlərdən və müjdə verilmişlərdən qərar ver

Məni zalımlara qalib et və həsəd edənlərin məkrindən amanda saxla. Məni məkr .edənlərin hiyləsindən qoru və zalımların əlini məndən üz

Məni Öz rəhmətinlə Əlayi İlliyində olan yaxşı əməl sahibləri ki, onlara nemət vermisən -peyğəmbərlər, doğruçular, şəhidlər və salehlərlə - bir yerdə qərar ver, ey !Rəhimlilərin ən Rəhimlisi

İlahi! Səni and verirəm günahlardan pak olan Peyğəmbərinin (s) haqqına və Sənin mütləq olası hökmlərinə, gizli qadağanlarına, bu şərəfli qəbrə ki, onun ziyarətinə get-gəl olunur və məzlum öldürülən məsum imam onun gölgəsində dəfn olunub; mənim qəmlərimi aç və mütləq olacağı qəza-qədərin şərrini məndən uzaq et. Məni odlu və .yandırıcı Cəhənnəmin odundan qoru

İlahi! Öz nemətinlə mənə böyüklük bağışla və məni öz qismətimə razı et. Öz bəxşiş və .kəraminlə mənim günahlarımdan göz yum. Məni Öz tədbir və cəzandan uzaq et

İlahi, məni azğındıqlardan qoru, sözümdə və əməlimdə möhkəm et. Ömrümü uzun et, dərd və xəstəliklərdən sağlamlıq bağışla. Məni övliyalarımın haqqına çatdır. Öz fəzl və .kəməminlə məni ən yaxşı arzularıma çatdır

İlahi, Mühəmməd və onun əhli beytinə salam göndər və mənim tövbəmi qəbul et, göz yaşlarıma rəhm et, azğınlığımdan keç, qəmlərimi aç, günahlarımı bağışla, nəslimi .salehlərdən et

İlahi, bu şərəfli hərəm və kəramətli məkanda mənə bağışlamadığın günah, örtmədiyin eyb, aradan aparmadığın qəm, artırmadığın ruzi, abad etmədiyin məqam, islah etmədiyin fəsad, çatdırmadığın arzu, qəbul etmədiyin düa, yaxşılaşdırmadığın hal, kökündən qazılıb atmadığın həsəd, aradan qaldırmadığın düşmənçilik, yaxşılaşdırmadığın pislik, şəfa bağışlamadığın xəstəlik, yaxınlaşdırmadığın uzaqlıq, .islah etmədiyin dağıntılıq, əta etmədiyin istək qalmağa qoyma

.İlahi, Səndən indiki xeyri və gələcək savabı istəyirəm

İlahi, halalın vasitəsi ilə məni haramdan ehtiyacsız et. Öz fəzlinlə məni bütün .camaatdan ehtiyacsız et

İlahi, Səndən fayda verən elm, xaşe’ qəlb, kamil yəqin, pak əməl, gözəl səbr, çoxlu əcr .istəyirəm

İlahi, yerinə yetirməli olduğum ne’mətlərin şükrünü mənə ruzi et. Ehsan və kərəmini mənə artır. Sözümü camaat arasında ötərli və qəbul olunan et. Əməlimi öz yanında .uca qərar ver. Mənim işlərimi xeyirli et. Düşmənlərimin kökünü kəs

İlahi, insanların ən xeyirliləri olan Mühəmməd və onun əhli beytinə gecənin və gündüzün bütün anlarında salam göndər və şər yetirə bilənlərin şərrini onlardan uzaq et. Məni günah və çirkinliklərdən pak et, Cəhənnəm atəşindən qoru və Cənnətdə qərar .ver

Məni və Sənin yolunda olan, bütün mömin qardaşlarımı və möminə bacılarımı Öz .rəhmətinlə bağışla, ey Mehribanların ən Mehribanı

**Mündəricat**

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹